məktəbin 1-ci sinfində “Simmetriya” mövzusunda bu termin daxil edilmədən propedevtik iş aparılır, 3-cü sinifdə isə "Simmetriya" mövzusundan əvvəl müstəvidə fiqurların çevrilməsi ilə tanış olurlar. Simmetriya mövzusu ilə tanışlıq praktik tapşırıqlar şəklində aparılır. Bu tapşırıqlar da uçaqlarda həndəsi qurma bacarıqlarını inkişaf etdirir.



Qurma məsələləri, ənənəyə görə (Evklidə ğörə), xətkeş və pərgarın köməyilə yerinə yetirilir. Bu məsələlər “verilən parçaya bərabər parşanı qurun”, “verilən çevrəyə bərabər çevrəni qurun” kimi tapşırıqlarla başlaya bilər. Löhədə parça çəkib uşaqlara dəftərlərində eyni uzunluqlu parçanı necə çəkmək olar sualı ilə müraciət etmək olar. yaxşı olar ki, xətkeşlə və xətkeşsiz, yalnız xətkeş və ya xətkeşlə pərgar üçün mümkün variantlar nəzərdən keçirilsin. Sonda hansı halda nəticənin daha dəqiq olduğu araşdırıla bilər.

Mürəkkəb qurma məsələlərinin tərkibinə daxil olan tez-tez rastlanan sadə qurma məsələləri arasında verilmiş parçanın yarıya bölünməsi, düz xətt üzərində verilmiş uzunluqda parçanın ayrılması, verilən bucağa bərabər bucağın qurulması, parçanın bərabər, mqtənasib hissələrə bölünməsi, verilmiş nöqtədən verilmiş parçaya paralel və ya perpendikulyar parçanın qurulması, üç tərəfinə görə üçbucağın qurulması və bu kimi digər məsələlər yer alır.

İbtidai siniflərdə qurma bacarıqlarının formalaşdırılması mərhələləri kimi

1. Hazırlıq mərhələsi: şablonlardan istifadə edərək həndəsi fiqurların təsviri.
2. Xətkeşdən istifadə etmədən əllə həndəsi fiqurların çəkilməsi.
3. Çertyoj alətləri ilə tanışlıq: xətkeş, üçbucaq və pərgar. Onlarla işləmək qaydaları.
4.Elementar qurma məsələlərinin həll etmə bacarığının formalaşması. Qərar vermək bacarığının formalaşdırılması.

Hər bir mərhələnin öyrənilməsində kompüter texnologiyalarından istifadə etmək mümkündür. Müxtəlif qrafik redaktorların köməyi ilə fiqurları çəkib əyani şəkildə göstərmək, multimediya proqramlarının vasitəsilə animasiya effektləri tətbiq edərək həndəsi fiqurların qurulma qaydasını öyrətmək olar.

Ibtidai siniflərdə uşaqlar oyundan ciddi dərs fəaliyyətinə keçir. Bu keçid çox zaman uşaqlarda psixoloji problemlər yaradır. KT-nın imkanlarından istifadə bu problemi aradan gotürməyə kömək edir. Ənənəvi dərslədə əldə etdiyi bilik, baçarıq və vərdişləri dərsdənkənar heç yerdə tətbiq edə bilməyən şagird kompüterdə oyunlar şəklində tətbiq edə bilir. Aşağı sinif şagirdləri çox emosional olduğundan dərslərdə KT-dan istifadə həm də emosional gərginliyi aradan qaldırmağa kömək edir.

Ibtidai sinif həndəsə materialı propedevtik xarakter daşıdığından bu mərhələdə kompüterdən əyani vəsaitlərin hazırlanması və nümayişi üçün istifadə edilir.

Qurma bacarığının formalaşması üçün şagird xətkeş və qələmdən istifadə etmək vərdişlərinə yiyələnməlidir.Bunun üçün isə dərslikdə, iş dəftərində, kompüterin ekranında rast gəlinən fiqurların dəftərdə çəkilməsi məqsədəuyğundur.

İbtidai siniflərdə aşağıdakı növ qurma məsələləri verilir:

1. Çertyoj alətlərindən istifadə etmədən damalı kağızda həndəsi fiqurların qurulması üçün tapşırıqlar.
2. Çertyoj alətlərindən istifadə etmədən damasız kağızda həndəsi fiqurların qurulması üçün tapşırıqlar.
3. Çertyoj alətlərindən istifadə etməklə həndəsi fiqurların qurulması üçün tapşırıqlar.

Elementar qurma məsələləri gələcəkdə şagirdlərə daha çətin qurma məsələlərini həll etməyə, ikiölçülü kağız üzərində üçölçülü fiqurları, onların kəsiklərini qurmağa kömək edəcək. Bizi əhatə edən dünya üçölçülüdür, ancaq ətrafdakı gerçəyi təsvir etməyə çalışdığımız kağız, təəssüf ki, yalnız ikiölçülüdür. Təsvir etdiyimiz obyektlərin mümkün qədər həcmli və real görünməsi üçün müəyyən qaydalara əməl edilməli və perspektiv düzgün qurulmalıdır. Əldə olunan qurma vərdişləri bu işin də öhdəsindən gəlmək üçün zəmin yaratmış olacaq.

## Nəticə

Həndəsi qurma məsələləri şagirdlərin çətinlik çəkdiyi mövzulardan biri olmuşdur. Ölçmə texnikası da həndəsi qurmada çox vacibdir və həllediciDir. Bəzi həndəsi anlayışlar bəzi şagirdlərə bir qədər mücərrəd görünə bilər. Lakin həndəsi konstruksiya yaxşı öyrədildikdə və fiziki konstruksiyalarla əlaqələndirildikdə, şagirdlərin şüurunda həndəsi anlayışlar daha konkret olar.

Ibtidai siniflərdə həndəsədən təklif olunan məsələlərdə:

- ✓ həndəsi fiqurlardan sayma obyekti kimi istifadə olunarsa- belə məsələlər adətən fiqurların adları, onları tanimaq və fərqləndirə bilmək bacarığı formalaşır;
- ✓ həndəsi ölçmələr tələb olunursa-bu onlarda parçanın uzunluğunu, sahəni ölçə bilmək qabiliyyətini formalaşır;
- ✓ hesablama tələb edilirsə-belə məsələlər həll etmək bacarığını təkmilləşir;
- ✓ qurma işləri lazım gəlirsə-xətkeş, və pərgarın köməyi ilə həndəsi fiqurların damalı və ağ vərəqdə qura bilmək bacarığı formalaşır;
- ✓ fiqurları təsnif etməq qabiliyyəti yaranır;
- ✓ fiqurların hissələrə, o cümlədən, bərabər hissələrə bölünməsi, verilən fiqurlardan yeni fiqur yaradılması bacarığı formalaşır.

Həndəsi qurmalar yerinə yetirilərkən tələblər oxu və yazmanı öyrədərkən olduğu kimi olmalıdır, yəni certyojların yüksək keyfiyyətlə yerinə yetirilməsi tələb olunmalıdır. Qurma işləri zamanı şagirdlərdə nə etdiyini izah etmə, termin və simvollardan istifadə etmə qabiliyyəti formalaşmalıdır.

Yekun olaraq qeyd edək ki, müvafiq metodikadan, tədris materiallarından istifadə şagirdlərdə həndəsi qurma məsələlərini həll etmə bacarıqlarını inkişaf etdirməyə kömək edəcək.

## References

1. “Visual geometry” notebook in mathematics for grade 1-4, Istomina N.B., M., 2004.
2. Minskin E.M., "From the game to knowledge" M. "Enlightenment", 1982.
3. Shapovalova O.E., "Workshop on special psychology" Textbook BSPI, Birobidzhan, 2000.
4. "Psychological and pedagogical diagnostics and counseling", Sekachev V. Institute for Humanitarian Research, M., 2006.
5. Jorge Angeles, Damiano Pasini, Fundamentals of Geometry Construction, Springer-2020, 43 p.
6. Badanova T.A. Methodology for the formation of spatial thinking of students in the study of geometry based on a synergistic approach: Abstract of the dissertation for the degree of candidate ped. Sciences / 2009.
7. Prasolov V.V. Problems in planimetry. -4th ed., supplemented -M.: Publishing House of the Moscow Center for Continuous Mathematical Education, 2001. -584 p.
8. Michael McDaniel,Geometry by Construction: Object Creation and Problem-solving in Euclidean and Non-Euclidean Geometries, 2019
9. Savin A.P. The method of geometric places / Optional course in mathematics: Textbook for grades 7-9 of high school. Comp. I.L.Nikolskaya. -M.: Enlightenment, p. 74.
10. Demidova, T.E. My mathematics: textbook for the 1st grade: in 1 part -M.: Balass, 2008.
11. Demidova, T.E. Mathematics (My Mathematics): textbook. for the 2th grade. -M.: Balass, 2009.
12. Demidova, T.E. Mathematics (My Mathematics): textbook. for the 3th grade. -M.: Balass, 2010.
13. Demidova, T.E. Mathematics (My Mathematics): textbook. for the 4th grade. -M.: Balass, 2010.
14. Drozd, V.L. Methods of elementary education in mathematics: textbook. settlement for ped. In-tov; under total ed. A.A.Stolyar, V.L.Drozda. -Minsk: Higher School, 1988.
15. Moreau, M.I. Mathematics: textbook. for the 1st grade beginning. school: in 2 part: part 1 -M.: Education, 2002.
16. Moreau, M.I. Mathematics: textbook. for the 1st grade beginning. school: in 2 part: part 2 -M.: Education, 2002.

Göndərilib: 12.02.2022 Qəbul edilib: 15.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/33-37

**Sevinj Tahmaz Hajiyeva**
Azerbaijan State Pedagogy University
PhD on the pedagogical sciences
h.sevinj_88@yahoo.com

## EFFECTIVENESS EMOTIONAL INTELLIGENCE (EI) IN TEACHING

### Abstract

The modern system encourages teachers to be more mobile, which requires qualities such as emotional intelligence and communication competence. In this research examined relationship between emotional intelligence and teaching effectiveness in high education. Teachers who are emotionally intelligent are more likely to identify their own emotional conditions and can avoid any negative situation by reflecting the awareness. High emotional intelligent teachers are more effective than low emotional intelligent teachers (Perry and Ball 2007). So the objective of my study is to make aware educational institutes about the positive role of emotional intelligence in effective teaching practice and to make them realize to provide trainings to the teachers about developing emotional intelligence in them.

***Key word:*** *High education, effective teaching, emotional intelligence (EI), teaching effectiveness*

**Sevinc Təhməz qızı Hacıyeva**

## Tədrisdə emosional zəka (ez) effektivliyi

### Xülasə

Müasir sistem müəllimləri daha mobil olmağa sövq edir ki, bu da emosional intellekt və ünsiyyət bacarıqları kimi keyfiyyətlər tələb edir. Bu tədqiqatda yüksək təhsildə emosional zəka ilə tədrisin effektivliyi arasında əlaqə araşdırılmışdır. Emosional intellektli müəllimlər öz emosional vəziyyətlərini daha çox müəyyən edə bilirlər və şüurunu əks etdirərək hər hansı neqativ vəziyyətdən qaça bilərlər. Yüksək emosional intellektli müəllimlər aşağı emosional intellektli müəllimlərdən daha təsirli olurlar (Perry and Ball 2007). Beləliklə, mənim tədqiqatımın məqsədi təhsil müəssisələrini emosional zəkanın effektiv tədris təcrübəsində müsbət rolu haqqında məlumatlandırmaq və onlarda emosional intellektin inkişafı ilə bağlı müəllimlərə təlimlər keçirmələrini həyata keçirməkdir.

***Açar sözlər:*** *yüksək təhsil, effektiv tədris, emosional intellekt (EI), tədrisin effektivliyi*

### Introduction

Teaching profession is highly emotional and social job with multi-dimension complexes (Hargreaves 1998; Sutton and Wheatley 2003; Stronge, Tucker and Hindman 2004) which requires a range of skills including content knowledge, pedagogical, class management, communications and instruction skills. The well-known British expert in the field of education development, Alan Mortiboys (2011), argued that a teacher brings two things to the classroom that are of value to the leaners. One is expertise in the subject, derived from study, research or professional experience. The other is knowledge of learning and teaching methods – a teacher’s pedagogy, such as how to structure the content being presented, how to encourage participation by leaners, use of materials and so on. In his view, emotional intelligence is the unrecognized third component of what a teacher should be able to offer to learners because emotional intelligence is that very important ingredient that makes the process of teaching highly effective.

“I believe that, the role of emotional intelligence is very important as emotional intelligence skills were linked to classroom management performance and also relates to retention factors for new and novice teachers. If teachers don’t use emotional intelligence in teaching the value of their knowledge of the subject and their learning and teaching methods can be seriously diminished.” (Alan Mortiboys 2011, p 4). According to Hay Mcber (2000) teachers’ effectiveness is based on the set of 12 characteris-

tics which are divided in to 4 clusters. One is professionalism which includes commitment, confidence, trustworthiness and respect, second is thinking which includes analytical and conceptual thinking, third is expectation which includes drive for improvement, information seeking and initiative and fourth cluster is leadership which includes flexibility, accountability and passion for learning. Along with these competencies teachers with high emotional intelligence skills are more effective ones (Stein and Book, 2006). Mayor and Sallovey (1990) defined emotional intelligence as "the abilaity to monitor one's own and other's feeling and emotions to discriminate among them and use this information to guide one's thinking and actions". Teaching profession is rated among the ten professions which require high level of emotional intelligence to get succeeded (Yate, 1997). Emotional intelligence is one of the valuable qualities for teachers to possess (Maree and Mokhuane, 2007). These skills can be developed at any age through various training programs for the professional effectiveness at the workplace (Goleman1998). Emotional intelligence trainings can bring positive changes in practices of teachers, behavior and relationship with students and overall meaningfulness of the professional development (Doleva and Leshema 2015)

## Literature Review Emotional Intelligence (EI)

Emotional intelligence is "your ability to recognize and understand emotions in yourself and others and your ability to use this awareness to manage your behavior and relationships.

Emotional intelligence is "something" in each of us that is a bit intangible. It affects how we manage behavior, navigate social complexities and make personal decision that achieve positive result" (Trans Bradberry and Jean Greaves). It explains how one behaves and manages it and he or she deals with the social difficulties to make his or her own decision that lead success. Emotional intelligence contains two primary competencies which are personal and social competencies.

Emotional intelligence as a term first time appeared in the works of Mayer and Sallovey (1990). They defined emotional intelligence as "the ability to monitor one's own and other's feeling and emotions to discriminate among them and use this information to guide one's thinking and actions". Goleman (1998) developed this idea and introduced the model of emotional intelligence focus on workplace. His approach is closely related to productivity and personal successfulness on the workplace.

According to David R.Caruse (2008) emotional intelligence is that emotions contain data and they send us a signal about what is going on in the world, or within ourselves. Emotion direct our attention and motivate us to engage in certain behaviors. These emotional signals heighten awareness in general, redirect our attention from whatever it is you were doing to an important event, and get you ready to act in some way. The most important aspect of emotions is to give us critical data about our interpersonal world.

There are three approaches to Emotional Intelligence (EI) that arguably have generated the most interest and/or research attention thus far. The three are: the Ability EI model, the Trait EI model, and the Mixed EI model.

Ability EI model (Mayer, 1990):

In this model, emotions are viewed as evolved signal systems and each emotion conveys a specific meaning. For example; fear conveys the possibility that one is under attack and will need to escape; happiness conveys the hope of joining with others. This idea of reasoning with and about emotional information is reflected in the following definition: "Emotional intelligence refers to an ability to recognize the meaning of emotion and their relationships and to reason and problem-solve on the basis of them. Emotional intelligence is involved in the capacity to perceive emotions, assimilate emotion-related feelings, understand the information of those emotions, and manage them [Joseph Ciarrochi, Joseph P. Forgas and John D.Mayer,2006, p.267]."

This model suggest four types of emotional abilities; one is emotional perception, second is emotional use, third is emotional understanding and fourth is emotional management.

## Trait EI model (Bar-On, 1997)

Bar-On defines EI as: "An array of no cognitive capabilities, competencies and skills that influence one's ability to succeed in coping with environmental demands and pressures"( BarOn,1997 ,p.14, italics in original). In other words, it is any ability or skill that is not specifically cognitive. This model is developed by Petrides in 2009 which is somehow different from the ability EI model. It describes that emotional traits of people are part of their personalities and self-perception but they cannot be measured scientifically but it can be measured by the selfreport of respondent assuming that the respondent is well aware of his own behavior and describe well. This model depicts EI as a brain-based ability of any person which does not include external aspect of personality in it. (Petrides. K.V. 2009) Mixed EI model (Goleman, 1998):

Goleman often characterizes EI as a list of personal and social characteristics. Those competencies are self-awareness, self-management, social awareness and social skills.

Self-Awareness: being self-aware means how someone is feeling in a particular moment and how he is making decision by using his gut feeling. Skills that are needed to have the competency of self-awareness are emotional self-awareness, accurate self-assessment and selfconfidence.

Self-management: to manage one's own emotions as they could not be able to interfere in any situation but be able to facilitate to face the situation. Skills required for self-management competency are self-control, trustworthiness, conscientiousness, adaptability, achievement orientation, initiative.

Social Awareness: to be able to sense the feelings of other to understand the situations from the perspectives of others. Skills that are required for this competency are empathy, organizational awareness, service orientation.

Social Skills: to be able to behave and interact well in social situations with respect to managing emotions and dealing with other people. By having social skills one can influence, lead, develop others, communicate, persuade, negotiate and will be able to manage conflict, build bonds, collaborate, manage change.

## Teacher Effectiveness

Teacher effectiveness is the impact that classroom factors, such as teaching methods, teacher expectations, classroom organization, and use of classroom resources, have on students' performance. (Kyriakides, Leonidas, Muijs, Daniel and more Taylor & Francis group 2004)

## Effective Teacher

Effective teacher is one who achieves his/her goal which he/she has set for him/herself. A teacher who possesses knowledge and skills which are needed to attain that goal is to be called an effective teacher (Aderson, 2004). According to Cedric Cullingford characteristics of the effective teacher are;

Integrity – the quality of someone who is doing his best, modestly and without selfcons-ciousness. No teacher is ever perfect but every teacher can try to do better. Often we are doing better than we think we are.

Learning – the quality of enjoying and sharing a sense of curiosity. The process of learning is similar at all stages; and the teacher is also involved in learning. Teaching is a chance to gain knowledge and insight.

Organization – the quality of managing a classroom, with good preparation, clear rules and expectations, attention to detail, the best use of the classroom facilities, as well as knowing when to teach the class as a whole, in groups or individually.

Communication – the quality of showing an interest in other people, both pupils and colleagues and being able to demonstrate that interest through ideas, and stories, as well as through shared values.

Humor – we need a sense of humor to survive and to avoid being burdened with all our other virtues.

All these qualities are central to effective teaching. They are developed through practice.

## Emotional Intelligence and Effective Teaching

It has been reported that emotionally intelligent individuals tend to make better team players, and they are more effective at motivating themselves and others. (Kets de Vries M. R.,2003) A growing body of research has focused on the importance of Emotional Intelligence characteristics as positive attributes in predicting the success of students and leader effectiveness (Adeyemo D. A. and Agokei R. C.2009, Watkin C.,2000, Goleman D.1999). Studies have found that a positive mood is associated with effective teaching (Watkin C.,2000, Centra J. A.,1993, Murray H. G 1991). In addition, people in positive moods tend to be more optimistic and have greater determination to achieve future success for themselves and others (Salovcy P. and Birnbaum D.,1989).

According to Hargreaves (2000) teachers must read students to know their emotions, expectations and conditions as it will lead them to better plan and manage the decisions about lectures, instructions, assessments and class management. Jha and Singh (2012) discussed that emotional management in a teacher is an important ability to inspire and motivate students. Teachers who manage their positive and negative emotions well within themselves are likely to understand more its influence on their work and overall performance and also on their relationships with their colleagues. That is why emotional stability in someone is highly correlated with management of relations. This concept has emerged as the second best and important predictor of teacher effectiveness. Management of relations with students actually creates a learning environment with positive attitude. This will resolve many problems of the students and teachers as well before becoming serious ones.

## Conclusion

As this study is aimed to provide an insight about the relationship between emotional intelligence and teacher effectiveness, researches has shown that there is positive relationship between EI and TE. A teacher with a high level of emotional intelligence will proved to be the highly effective teacher. Emotional intelligent persons are aware about their own and others' emotions as well so they can manage with their own emotions and the relationships with others as well. As teaching profession is highly emotional job so it involves a variety of competencies which are of emotional intelligence. This study will further be continued by collecting data from a sample of teacher from an academic institute to prove the results empirically.

## Reference

1. Annaraja, P. and Jose, S. (2005) Emotional intelligence of B. Ed. trainees. Research and Reflections in Education pp.2, 8-16.
2. Bar-On, R. (2000). Emotional and social intelligence: Insights from the Emotional Quotient Inventory (EQ-i). In R. Bar-On and J. D. A. Parker (Eds.), Handbook of emotional intelligence. San Francisco: Jossey-Bass.
3. Bar-On,R (1997), Bar-on Emotional Quotient Inventory: Technical Manual. Toronto, Canada: Multi Health System.
4. Career Smarts: Jobs with a Future by Martin Yate (1997-02-11) Mass Market Paperback – January 1, 1895.
5. Cassell Education Cedric Cullingford 1995, London, "The Effective Teacher".
6. Centra J.A., "Reflective faculty evaluation: Enhancing teaching and determining faculty effectiveness", San Francisco, Jossey-Bass, 1993.
7. Goleman D., "Future trends in emotional intelligence in the workplace", Roundtable discussion at the conference for Emotional Intelligence, Chicago IL, 1999.
8. Goleman, D. (1998) Working with Emotional Intelligence, New York; Bantam.
9. Jha and Singh "Teacher Effectiveness in Relation to Emotional Intelligence Among Medical and Engineering Faculty Members" 2012, https://ejop.psychopen. eu/index.php/ ejop/article/view/483
10. Joseph Ciarrochi, Joseph P.Forgas and John D.Mayer 2006, second edition, "Emotional Intelligence in everyday life."

11. Kets de Vries M. R., “Putting leaders on the couch. Harvard Business Review”, 2004. Retrieved April23,2013,fromhttp://harvardbusinessonline.hbsp.harvard.edu/b01/en/hbr/hbrsa/current/0
12. 401/article/r0401F
13. Kyriakides, Leonides; Muijs, Daniel and more Taylor & Francis group “Assessing Teacher Effectiveness: Different Models”2004.
14. L.Jahangiri, T.W.Mucciolo, M.Choi, and A.I.Spielman,(2008) “Assessment of teaching effectiveness in U.S. Dental schools and the value of triangulation,”Journal of Dental Education. pp.707-718
15. Mayer, J. D.,Salovey, P. (1990). Emotional Intelligence.
16. Mayer, J.D, Caruso,D.R., Salavey, P, (1999) “Emotional Intelligence meets traditional standards for an intelligence” ,p267-268.
17. McBer, H. Research into Teacher Effectiveness: A Model of Teacher Effectiveness. Nottingham: Department for Education and Employment, 2000.
18. Mishra, M. Teaching work motivation among emotionally intelligent studentteachers. Journal of Educational Studies, 2006, 4 (1 &2), 40-41.
19. Mortiboys, A. Teaching with Emotional Intelligence: A step by step guide for Higher and Further Education professionals, London. England: Taylor & Francis, 2011.
20. Murray H. G., “Effective teaching behaviors in the college classroom”. In J. C. Smart (Ed.). Higher Education: Handbook of Theory and Research, New York, Agathon Press, pp. 8, 1991.
21. O.Aregbeyen. “Students’ perceptions of effective teaching and effective lecturer characteristics at the University of Ibadan, Nigeria,” Pakistan Journal of Social Sciences,2010 pp 62-69
22. Petrides,K.V., Psychometric properties of the Trait Emotional Intelligence Questionnaire, London, 2009.
23. R.J. Emmerling. Emotional Intelligence: Theoretical and cultural Perspectives, USA, Nova Science Publisher, 2008.
24. Salovcy P. and Birnbaum D., “Influence of mood on health-relevant cognitions”, Journal of Personality and Social Psychology, vol. 57, pp. 539-551, 1989.
25. Sibia, A., Srivastava, A.K. & Mishra, G. Towards understanding emotional intelligence in the Indian context. Psychological Studies, 2004, 49, (2-3), 68-77.
26. Singh R. Study of Emotional Intelligence and adjustment of teachers in different levels of education. M.Ed. Dissertation, D.E.I. Agra, 2003.
27. Stein and Book, January, 2006 “Emotional Intelligence and Your Success”
28. Watkin C., “The leadership programme for serving head teachers: Probably the world’s largest leadership development initiative”, The Leadership & Organization Development Journal, vol/issue: 21(1), pp. 13-19, 2000.

Göndərilib: 18.02.2022 Qəbul edilib: 17.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/38-43

**Zeynəb Şahvələd qızı Rüstəmova**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası
baş müəllim
zemarustamova@rambler.ru

# MULTİKULTURALİZM ETNİK-MƏDƏNİ MÜXTƏLİFLİYİN TƏNZİMLƏNMƏSİNİN SƏMƏRƏLİ SİYASƏT MODELİ KİMİ

**Xülasə**

Multikulturalizm siyasəti cəmiyyətdə mövcud olan etnik, irqi, dini və mədəni müxtəlifliklərə münasibətdə dövlətin apardığı konkret siyasəti xarakterizə edir. Bu siyasətin əsasında isə cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklərin qorunması durur. Multikulturalizm siyasətinin meydana gəlməsindən əvvəl etnik, irqi, dini və mədəni müxtəlifliklərlə üzləşən dövlətlər bu müxtəliflikləri assimilyasiya və izolyasiya vasitəsilə tənzimləməyirdi.

Müəyyən tarixi dövrlərdə, həmçinin müasir dövrdə də tətbiq olunan assimilyasiya, izolyasiya və izolyasiyanın variantı olan aparteid siyasət modellərindən fərqli olaraq multikulturalizm siyasəti etnik-mədəni müxtəlifliyin və onların əsasını təşkil edən dəyərlərin qorunmasına yönəlmişdir.

***Açar sözlər**: multikulturalizm, tolerantlıq, assimilyasiya, izolyasiya, etnik-mədəni müxtılifliklər*

**Zeynab Shahvalad Rustamova**

## Multiculturalism as an effective policy model for the regulation of ethnic-cultural diversity

**Abstract**

The policy of multiculturalism characterizes the specific policy of the state in relation to ethnic, racial, religious and cultural diversity in society. The basis of this policy is the protection of ethnic, racial, religious and cultural diversity in society. Prior to the emergence of the policy of multiculturalism, states facing ethnic, racial, religious and cultural differences did not regulate these differences through assimilation and isolation.

Unlike apartheid policy models, which are a variant of assimilation, isolation and isolation applied in certain historical periods, as well as in modern times, the policy of multiculturalism is aimed at preserving ethnic and cultural diversity and the values that underlie them.

***Key words:** multiculturalism, tolerance, assimilation, isolation, ethnic-cultural diversity*

Multikulturalizm siyasəti cəmiyyətdə mövcud olan etnik, irqi, dini və mədəni müxtəlifliklərə münasibətdə dövlətin apardığı konkret siyasəti xarakterizə edir. Bu siyasətin əsasında isə cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklərin qorunması durur. Multikulturalizm siyasətinin meydana gəlməsindən əvvəl etnik, irqi, dini və mədəni müxtəlifliklərlə üzləşən dövlətlər bu müxtəliflikləri assimilyasiya və izolyasiya vasitəsilə tənzimləməyirdi.

Assimilyasiya siyasəti milli azlıqların etnik-mədəni deyərlərini titul etnosun mədəniyyətinə qatmaqla cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklərin ləğv edilməsin nəzərdə tutur. Bir qayda olaraq assimilyasiya siyasəti milli azlıqların dillərinin, mədəniyyətlərinin, hətta bir çox hallarda milli özünüdərketmələrinin itirilməsi ilə nəticələnir.

Assimilyasiya *könüllü və zorakı* yolla həyata keçirilə bilər. Birinci halda milli azlıqlar düşdükləri şəraitə uyğunlaşmaq, orada irəliləmək üçün titul xalqın qoyduğu tələblərə uyğun olaraq onun təklif etdiyi mədəni dəyərləri qəbul edirlər. Nəticədə onlar tamamilə də olmasa müəyyən dərəcəcə öz adət-ənənələrindən könüllü şəkildə əl çəkirlər, dillərini tədricən unudurlar.

Könüllü assimilyasiya zamanı milli azlıqların etnik-mədəni dəyərlərinin müəyyən elementləri titul etnos tərəfindən qəbul oluna bilər. Nəticədə bu elementlər yeni formalaşmış mədəniyyətin tərkib hissəsi kimi özünü büruzə verir. Başqa sözlə desək könüllü assimilyasiya titul xalqla milli azlıqların etnik-mədəni dəyərlərinin bir-birinə qarşılıqlı təsiri ilə xarakterizə olunur.

*Zorakı assimilyasiya* məqsədyönlü şəkildə titul etnos tərəfindən həyata keçirilən siyasətdir. Bu siyasətin əsas məqsədi milli azlıqlara məcburi şəkildə hakim mədəniyyətin dəyərlərinin yeridilməsidir. Zorakı assimilyasiya *akkulturasiya* prosesinin bir forması kimi çıxış edir. A*kkulturasiya* bir xalqın başqası tərəfindən işğalı nəticəsində baş verir və işğala məruz qalan xalq öz etnik-mədəni *dəyərlərindən* əl çəkməyə və onu işğal etmiş xalqın təklif etdiyi dəyərləri qəbul etməyə məcbur olur.

Zorakı assimilyasiyanın mahiyyəti amerikalı politoloq Qordonun 1966-cı ildə Nyu Yorkda dərc etdiyi *"Amerika həyatında assimilyasiya: irqin, dinin və milli mənşəyinin rolu"* adlı kitabında təqdim etdiyi *anqlokonformizm nəzəriyyəsində* açıqlanır. Bu nəzəriyyəyə əsasən, ABŞ miqtantları qəbul edən ölkə kimi onları assimilyasiya məruz qoyaraq doğma mədəniyyətlərini və dillərini unutdurur. Sonra da onları hakim anqlosakson mədəniyyətini, ingilis dilini universal dəyərlər kimi qəbul etməyə məcbur edir. (1, s. 14)

Könüllü assimilyasiyanın nəticəsində yeni yaranmış mədəniyyətdə milli azlıqların etnik-mədəni dəyərlərinin müəyyən elementləri az da olsa qalır. Zorakı assimilyasiya isə yeni mədəniyyəti yalnız titul xalqın mədəniyyətinin yaradır. Assimilyasiyanın könüllü və zorakı növləri arasındakı bu fərqə baxmayaraq onlara xas olan bir ümumi cəhət vardır. Onların hər biri cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklərin ləğv edilməsinə yönəlmişdir.

İzolyasiya siyasəti milli azlıqların etnik-mədəni dəyərlərinin titul etnosunun etnik-mədəni dəyərləri ilə hər hansı bir əlaqəsinin qarşısını alınmasını nəzərdə tutur. İzolyasiya siyasəti 2 formada özünü büruzə verir.

1.Miqrantların xüsusilə milli azlıqların nümayəndələrinin ölkəyə daxil olub orada məskunlaşmasına mane olur;

2.Cəmiyyətdə artıq məskunlaşmış milli azlıqların nümayəndələrinin xalqın mədəniyyətinə assimilyasiyasına mane olmaq məqsədilə onları təcrid edir. İkinci halda bu siyasət aparteid adlanır.

Bəzi tədqiqatçılar bu və ya digər ölkədə etnik-mədəni müxtəlifliyin yaranmasının qarşısının alınmasının praktiki cəhətdən ən real yolu miqrantların, xüsusilə də milli azlıqlara mənsub olan miqrantların ölkəyə daxil olmalarının qarşısının alınması olduğu qeyd edir (2, s. 3). Bu cür məhdudiyyətin tətbiq olunmasının, yəni immiqrasiya siyasətində izolyasionizmin tətbiq edilməsinin bir çox səbəbləri vardır. Məsələn, hakimiyyətdə olanlar öz üstünlüklərini və ya imtiyazlarını saxlamaq istəyirlər. İmmiqrasiya siyasətində izolyasionizmin tətbiq edilməsinin əsas səbəbi kimi mədəni *transformasiya* qorxusunu gösrərmək olar. Söhbət özgə mədəniyyətə mənsub olan immiqrantların ölkəyə köçmələri nəticəsində özləri ilə yanaşı mədəniyyətlərini də gətirəcəklərindən və bunun nəticəsində ölkədə mədəni homogenliyin pozulmasından gedir. Milli azlıqlara mənsub olan miqrantların ölkəyə daxil olmalarının qarşısının alınmasına yönələn immiqrasiya siyasəti Avstraliya və Yaponiya tarixlərinin müxtəlif mərhələlərində tətbiq etmişdi. Bu siyasət əsasən, ölkədə ağların və ingilis mədəniyyətinin hakimliyini təmin etmək məqsədilə ölkədə ilk növbədə britaniyalıların məskunlaşmasına icazə verilirdi. Britaniyalılardan sonra Şimali Avropadan olan immiqrantlar arzuolunan hesab olunurdular. Cənubi avropalılara bir qədər aşağı kateqoriyalı immiqrant kimi yanaşılırdı. Asiyalı və ağ dərili olmayan digər immiqrantların Avstraliyada məskunlaşmasına isə münasibət mənfi idi [85]. Avstraliyada ağların çoxluğunu və ingilis mədəniyyətinin geniş yayılmasını təmin etmək məqsədilə ölkəyə köçən britaniyalılara müəyyən güzəştlər də edilirdi. Avstraliya hökuməti ayrı-seçkiliyə əsaslanan bu immiqrasiya siyasətini yalnız 1973-cü ildə rəsmi ləğv etdi. Bu cür məhdudiyyətlə mədəni transformasiya prosesinin qarşısını almaq mümkün deyil. Çünki müasir dövrdə cəmiyyətdəki mədəni homogenliyin pozulması immiqrasiya ilə yanaşı turizm, ticarət və xalqlar arasında kommunikasiyanın digər növləri nəticəsində baş verir.

İzolyasiya siyasətinin ikinci forması aparteid siyasəti ilə bağlıdır. Aparteid siyasəti cəmiyyətdə artıq məskunlaşmış milli azlıqların nümayəndələrinin titul xalqın mədəniyyətinə assimilyasının qarşısının alınmasını nəzərdə tutur.

Aparteid Cənubi Afrika Respublikasında 1948-1994-cü illərdə qeyd olunan dövr ərzində hakimiyyətdə olan Milli partiya tərəfindən aparılırdı. Bu siyasətin əsasını irqi ayrı-seçkilik təşkil edirdi. Aparteid siyasəti ölkə əhalisini 4 irqi qrupa bölürdü: "qaralar", "ağlar", "rənglilər" və "hindlilər". Onların vətəndaş hüquqları xeyli məhdudlaşdırıldı. Hakimiyyətdə olan irqçilər ayrı-seçkiliyi həyatın bütün sahələrində tətbiq edirdilər. Qeyri-ağ əhali üçün təhsil, səhiyyə, digər xidmət sahələri ayrılıqda fəaliyyət göstərirdi.

Beləliklə, multikulturalizm siyasətinin meydana gəldiyindən əvvəl cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklər assimilyasiya və izolyasiya siyasətləri vasətisilə tənmizlənirdi. Tarixi hadisələrin sonrakı gedişatı etnik-mədəni müxtəlifliyin tənzimlənməsinə yönələn bu iki siyasət modelinin səmərəsizliyini göstərdi. Belə ki, xalqların dünyagörünüşünün və fəaliyyətlərinin əsasını təşkil etməklə həyatlarında müsbət rol oynayan etnik-mədəni dəyərlərin rolunun artdığı bir dövrdə assimilyasiya siyasətinin düzgün olmadığı kimi, qloballaşma, mədəniyyətlərin qovuşduğu bir şəraitdə izolyasiya siyasətinin də yalnış olduğu müəyyən olundu. Etnik, irqi, dini və mədəni müxtəlifliklərin tənzimlənməsinə yönəlmiş assimilyasiya və izolyasiya siyasətlərinin iflasa uğraması ötən əsrin 70-ci illərində əvvəlcə Kanadada, sonra isə Avropanın bir sıra çoxmədəniyyətli ölkələrində multikulturalizm siyasətinin meydana gəlməsinin başlıca səbəblərindən biri olmuşdur.

Cəmiyyətdəki etnik, irqi, dini və mədəni müxtəlifliklərin qorunmasına istiqamətlənən multikulturalizm siyasəti müxtəlif formalarda həyata keçirilə bilər. bununla bağlı bu siyasətin 2 əsas formasını göstərmək lazımdır: zəif və güclü formalarını. Multikulturalizmin bu formaları arasında mühüm fərqli cəhətləri vardır.

Multikulturalizmin zəif forması etnik-milli azlıqlara öz etnik-mədəni dəyərlərini qorumaq üçün imkan yaradır. Lakin azlıqlar öz imkanları ilə etnik-mədəni dəyərlərini qorumaq iqtidarında olmadıqlarına görə yaranmış situasiyada cəmiyyətdəki hakim etnik-mədəni dəyərlərin qəbul edilməsini ən optimal çıxış yolu kimi dəyərləndirirlər. Başqa sözlə desək, onlar elə bir vəziyyətə düşürlər ki, onlara xarici təzyiq olmadan, öz istəkləri ilə titul xalqın etnik-mədəni dəyərlərini qəbul etmək sərf edir. Öz mədəni kimliyini, etnik-mədəni dəyərlərini qorumaq isə çətin olur. Mövcud vəziyyətdə azlıqların başqa çıxış yolu olmadığına görə, onlar könüllü şəkildə etnik-mədəni dəyərlərini qorumaq fikrindən tamamilə də olmasa müəyyən dərəcədə əl çəkirlər və bununla da yaşadıqları cəmiyyətə *inteqrasiya* olunmağı praktiki cəhətdən daha əlverişli hesab edirlər. Məsələn, multikulturalizmin zəif forması çoxmillətli Sovet İttifaqında müşahidə olunurdu. SSRİ-nin tərkibində olan bütün qeyri-rus itiifaq respublikalarının ərazilərində öz dillərini, ədəbiyyatlarını, mədəniyyətlərini qorumağa və inkişaf etdirməyə geniş imkanları olsa da, onlar daha çox rus xalqının etnik-mədəni dəyərlərini, tarixini öyrənməyə, rus dilində təhsil almağa üstünlük verirdilər. Çünki bu, onlara şəxsi karyeralarını qurmaqda, yaşadıqları cəmiyyətin bütün sahələrində nailiyyətlər əldə etməkdə köməklik edirdi.

Müasir dövrdə təxminən oxşar vəziyyət bir çox Qərb ölkələrində (ABŞ, Kanada, Niderland, Böyük Britaniya, Avstriya və b.) müşahidə olunur. Bu ölkələrdə yaşayan milli azlıqların nümayəndələrinə onların etnik-mədəni dəyərlətrinə münasibətdə tolerantlıq nümayiş etdirilir. Belə bir münasibətin nəticəsində milli azlıqların nümayəndələrinə yaşadıqları Qərb dövlətlərində öz adət-ənənələrini qorumaq, ana dillərində qəzet və jurnal çıxarmaq, hətta ana dilində məktəb açmaq hüquqları verilmişdir. Klassik liberal cəmiyyət qeyri-liberal elementləri ehtiva edə bilər. Liberal cəmiyyətlərin milli azlıqların nümayəndələrinə nümayiş etdirdiyi tolerantlıq azlıqların etnik-mədəni dəyərlərini nə assimilasiya edir, nə də onu təcrid edir.

Multikulturalizmin zəif formasından fərqli olaraq onun güclü forması milli azlıqlara öz etnik-mədəni dəyərlərini qorumaq üçün azadlıq verməklə yanaşı onların yaşadıqları cəmiyyətin bütün sahələrində fəal iştirak etmələri üçün hər cür şəraitin yaradılmasını tələb edir. Multikulturalizmin güclü forması cəmiyyətdəki etnik-mədəni müxtəlifliyə münasibətdə dözümlülüyün nümayiş etdirilməsi ilə kifayətlənmir. O, bu müxtəlifliyin dövlət tərəfindən qorunmasını və inkişaf etdirilməsini, onun maddi, hüquqi və mənəvi cəhətdən dəstəklənməsini vacib hesab edir. Multikulturalizmin tanınmış tədqiqatçılarından olan professor Vil Kimlika göstərir ki, dövlət onun ərazisində yaşayan bütün etnik, dini və irqi qrupların hüquqlarını tanımalı və onların mədəniyyətlərinin qorunması istiqamətində xüsusi proqramlar təklif etməlidir.

Tarixi prosesdə formalaşan, müsbət və obyektiv xarakter daşıyan, insanların dünyagörünüşünün və fəaliyyətlərinin məzmununu müəyyən edən və istiqamətləndirən etnik-mədəni müxtəliflik və onun əsasını təşkil edən etnik-mədəni dəyərlər müasir ictimai inkişafda müəyyənedici rol oynayır. Bu isə müasir dövrdə mədəniyyətin ictimai inkişafında aparıcı rol oynamasından irəli gəlir. Bu isə ictimai inkişafın, xüsusilə də onun səbəb və istiqamətinin, o cümlədən xalqların ölkə daxilində və beynəlxalq münasibətlər sistemində davranışının tədqiq olunmasının ən mühüm metodoloji prinsiplərindən biridir.

Mədəniyyətin ictimai inkişafda aparıcı rolunun artması müasir ictimai inkişafın xüsusiyyətlərindən irəli gəlir. Bu xüsusiyyətlər isə dünya kommunist sisteminin dağılması və beynəlxalq münasibətlərin

yeni sisteminin formalaşması ilə bağlıdır. Soyuq müharibə illəri dövründə ideoloji, siyasi, iqtisadi və hərbi sahələrdə bir-birinə düşmən olan iki siyasi sistem-keçmiş Sovet İttifaqının başçılıq etdiyi kommunist sistemi və ABŞ-ın ətrafında birləşən Qərb dünyası – qarşı-qarşıya duranda onların xalqlarını, həmçinin bu sistemlərdən birinə mənsub olan "üçüncü dünya" ölkələrinin xalqlarını ilk növbədə qarşı tərəfdən gələ bilən təhlükə narahat edirdi. Belə olan şəraitdə bu xalqlar arasında əsas fərqli cəhətlər ideoloji, siyasi yaxud iqtisadi xarakter daşıyırdı. Dünya kommunist sisteminin dağılması eyni zamanda bir-birinə zidd olan iki sosial-siyasi sistemdən birinin tarix arenasindan getməsinə gətirdi. Nəticədə dünya xalqları öz mədəni köklərinə, daha konkret desək, etnik-mədəni dəyərlərinə müraciət etmək imkanını əldə etdilər. Başqa sözlə desək, dünya kommunist sisteminin dağılması soyuq müharibəyə son qoymaqla bir-birinə zidd olan iki sosial-siyasi sistemin siyasi, hərbi iqtisadi və ideoloji qarşıdurmasını aradan qaldırdı. Post-kommunist dövrdə tarixinə, dininə, dilinə və ümumiyyətlə etnik-mədəni dəyərlərinə müraciət edən xalqlar öz kimliyini müəyyən edirlər. Bu dəyərlər xalqlar arasında olan əsas fərqləri təşkil edir. Samuil Hantinqon bu haqda fikrini bu cür ifadə edir: "Yeni dünyada xalqlar arasında əsas fərqlər ideoloji, siyasi iqtisadi deyil, mədəni xarakter daşıyır" (3, s.21).

Müasir Qərb ədəbiyyatında Samuel Hantinqton, Ronald İnqleqard (5), Frensis Fukuyama (6), Zbiqnev Bjejinski (7), Fərid Zəkəriyyə (8) və başqa müəlliflər ictimai inkişafda mədəniyyətin aparıcı rol oynadığını qeyd edirlər.

İctimai inkişafda mədəniyyətin aparıcı rol oynaması müasir dövrdə etnik-mədəni müxtəlifliyin və onun əsasını təşkil edən etnik-mədəni dəyərlərin qorunmasının və inkişafının vacibliyini əsaslandırır. İctimai inkişafda mədəniyyətin aparıcı rol oynaması multikulturalizm siyasətinin düzgün siyasət olduğunu sübut edir. Bunu tarixi hadisələrin gedişatı da sübut etdi. Belə ki, etnik-mədəni müxtəlifliyin dövlət tərəfindən tənzimlənməsi tarixi assimiliyasiya və izolyasiya siyasət modellərinin səmərəsizliyini göstərməklə ötən əsrin 60-70-ci illərində multikulturalizm siyasətinin müydana gəlməsinin başlıca səbəblərindən biri olmuşdur.

Multikulturalizm məfhumunun məzmununu daha da aydın şəkildə müəyyənləşdirmək üçün onu tolerantlıq və interkulturalizm məfhumları ilə müqayisə etmək məqsədəuyğundur.

Multikulturalizm məfhumu öz məzmununa görə tolerantlıq məfhumuna yaxındır. Daha konkret desək, tolerantlıq multikulturalizm siyasətinin əsasını təşkil edir. Multikulturalizm bir siyasət kimi bu azlıqlara və onlara məxsus olan etnik-mədəni dəyərlərə münasibətdə titul xalq tərəfindən dözümlülüyün, yəni tolerantlığın nümayiş etdirilməsini nəzərdə tutur.

"Multikulturalizm etnik və dini azlıqlara münasibətdə tolerantlıqla yanaşı onlara və onların etnik-mədəni dəyərlərinə hörmətlə yanaşmanı da ehtiva edir" (4, 79). Bununla əlaqədar tanınmış britaniyalı tədqiqarçı Bhixu Parex qeyd edir ki, multikulturalizm şəraitində etnik və dini azlıqların tanınması tələbi tolerantlığı aşaraq cəmiyyətdə mövcud olan müxtəliflikləri qəbul etməyi, onlara hörmətlə yanaşmanı və hətta onları təsdiq etməyi nəzərdə tutur.

Multikulturalizm və interkulturalizm məfhumlarına gəldikdə isə qeyd etmək lazımdır ki, bəzən ədəbiyyatda bu məfhumları bir-biri ilə qarışdırırlar, hətta onları səhvən eyniləşdirirlər. Lakin bu, düzgün deyil. Çünki multikulturalizm və interkulturalizm məfhumları arasında müəyyən fərqli cəhətlər vardır.

Etnik-mədəni müxtəlifliyin daşıyıcılarının birgəyaşayışını, onlar arasında tolerantlığın, hətta qarşılıqlı hörmətin inkişaf etdirilməsini nəzərdə tutan multikulturalizm siyasəti bu müxtəlifliyi bəzən qabartmaqla, mütləqləşdirməklə cəmiyyətdə sosial fraqmentasiya, dezinteqrasiya hallarının yaranmasına səbəb olur. Belə hallar xüsusilə müasir liberal demokratiya ölkələrində baş verir.

Multikulturalizm siyasətinin həyata keçirilməsində, onun prinsiplərinə riayət olunmasında bütün ölkələrdə dövlət aparıcı rol oynayır. Multikulturalizmin siyasətindən imtina etmiş bir neçə liberal demokratiya ölkələrinin təcrübəsi göstərir ki, cəmiyyətdə mövcud olan etnik, irqi, dini və mədəni müxtəlifliklər müasir liberalizmin pronsiplərinə əsasən tənzimləndikdə, yəni dövlət milli azlıqların etnik-mədəni dəyərlərinin qorunmasına və inkişaf etdirilməsinə münasibətdə həddindən artıq səy göstərdikdə, bu işdə onlara tam azadlıq verdikdə, digər tərəfdən isə onların yaşadıqları cəmiyyətə inteqrasiya olunmaları istiqamətində lazımi tədbirlər görmədikdə, milli azlıqlar cəmiyyətdə titul xalqın geniş yayılmış etnik-mədəni dəyərlərindən, müəyyən olunmuş etnik-davranış normalarından təcrid olunaraq, hətta bəzən bu dəyərlərə və normalara qarşı müqavimət göstərərək öz etnik-mədəni dəyərlərinə sığınırlar. Belə olan şəraitdə cəmiyyətdə dezinteqrasiya prosesləri baş verir. Cəmiyyət müxtəlif etnik, dini icmalara bölünür. Bu icmalar arasında dialoq və əməkdaşlıq əlaqələri zəif olur.

Məlum olduğu kimi, müxtəliflikdə birlik konsepsiyası həm eyniliksiz, oxşarlıqsız birlik, həm də parçalanma olmayan müxtəliflik deməkdir. Müxtəliflikdə birliyi təcəssüm edən cəmiyyət və ya interkultural cəmiyyət etnik-mədəni müxtəlifliyə münasibətdə nümayiş olunan dözümsüzlüklə, bu müxtəlifliyi tanımaqla və qorumaqla məhdudlaşmır. O, etnik-mədəni müxtəlifliyin qorunmasına, inkişafın mühüm səbəblərindən biri kimi yanaşaraq onların bir-birilə qovuşmasına, birləşməsinə şərait yaradır. Müxtəlifliklərin birləşməsi isə öz növbəsində onlar arasında qarşıdurma təhlükəsini aradan qaldırır və ümumilikdə cəmiyyətin zənginləşməsinə səbəb olur.

Böyük Britaniya və digər liberal demokratiya ölkələrində etnik və dini azlıqlar üçün dövlət tərəfindən yaradılan şərait onların özünə qapanmasına, cəmiyyətdən təcrid olmalarına, ona inteqrasiya olmaq istəməmələrinə gətirir. Belə şərait həm hakim dairələrin, həm də azlıqların nümayəndələrinin maraqlarına ziddir. Belə ki, cəmiyyətdə inteqrasiya proseslərinin olmaması orada parçalanma proseslərini inkişaf etdirir və mədəniyyətlərarası, dinlərarası qarşıdurmaya səbəb olur.

Etnik-mədəni müxtəlifliklər, etnik-mədəni dəyərlər bir-birilə qovuşduqda, yaxınlaşdıqda, dialoqa girdikdə mədəniyyətlərarası, dinlərarası dialoqun, əməkdaşlığın, ümumiyyətlə cəmiyyətin inkişafına səbəb olur. Əks halda, yəni bu müxtəlifliklər, dəyərlər mütləqləşdirildikdə, bir-birinə qarşı qoyulduqda qarşıdurmaya, münaqişəyə səbəb olur. İnterkulturalizmin əsas müabət cəhətlərindən biri odur ki, o, etnik-mədəni müxtəlifliyin pozitiv potensialını üzrə çıxarır, neqativ potensialının isə reallaşmasına imkan vermir.İnterkulturalizmin qeyd olunan müsbət cəhətinin reallaşdırılmasının əsas şərti onun multikulturalizmə əsaslanmasıdır. Cəmiyyətdəki etnik-mədəni müxtəliflik tanınmadıqda, qorunmadıqda onlar arasında dialoq və əməkdaşlıq münasibətlərinin yaradılması mümkün olmur. Bu isə öz növbəsində istər ölkədaxili müstəvidə, istərsə də beynəlxalq müstəvidə dinlərarası, mədəniyyətlərarası dialoqun və əməkdaşlığın inkişafının qarşısını alaraq etnik və dini zəmində qarşıdurmaya səbəb olur.

“Müasir dövrdə İnctimai inkişafda mədəniyyətin aparıcı rol oynaması ideyası ictimai inkişafın, xüsusilə də onun səbəb və istiqamətinin, o cümlədən xalqların ölkə daxilində və beynəlxalq münasibətlər sistemində davranışının tədqiq olunmasının ən mühüm metodoloji prinsiplərindən biridir” (5, s. 65).

Beləliklə, öz həcminə görə interkulturalizm məfhumu multikulturalizm məfhumundan genişdir. Tolerantlıq multikulturalizmin əsasını təşkil etdiyi kimi, multikulturalizm də interkulturalizmin əsasının təşkil edir. Eyler dairəsi tolerantlıq, multikulturalizm və interkulturalizm məfhumlarının bir-birilə münasibətləri aşağıdakı şəkildə təsvir olunmuşdur.

**Nəticə**

Müəyyən tarixi dövrlərdə, həmçinin müasir dövrdə də tətbiq olunan assimilyasiya, izolyasiya və izolyasiyanın variantı olan aparteid siyasət modellərindən fərqli olaraq multikulturalizm siyasəti etnik-mədəni müxtəlifliyin və onların əsasını təşkil edən dəyərlərin qorunmasına yönəlmişdir. Multikulturalizm titul etnos ilə milli azlıqların etnik-mədəni dəyərlərinin inkişafına eyni şərait yaratmaqla onların mədəniyyətlərinin qarşılıqlı təsiri üçün zəmin yaradır.

Etnik-mədəni müxtəlifliklər, etnik-mədəni dəyərlər bir-birilə qovuşduqda, yaxınlaşdıqda, dialoqa girdikdə mədəniyyətlərarası, dinlərarası dialoqun, əməkdaşlığın, ümumiyyətlə cəmiyyətin inkişafına səbəb olur. Əks halda, yəni bu müxtəlifliklər, dəyərlər mütləqləşdirildikdə, bir-birinə qarşı qoyulduqda qarşıdurmaya, münaqişəyə səbəb olur.

**Ədəbiyyat**

1. Gordon, M. Assimilation in American Life: The Role of Race, Religion and National Origins. Oxford University Press, New York, 1996, p.14
2. Kukathas, C. Theoretical Foundations of Multicultralism. http//econfaculty.gmu.edu / probettke/ workshop /fall04/theoretical _foundations.pdf p.3
3. Humtington, S. The Clash of Civilizations and the Remaking of World Order. New York, Simon and Schuster, 1996, p.21.
4. E.Nəcəfov. Multikulturalizmin soisal-fəlsəfi təhlili. Bakı, 2020
5. E.Nadjafov. K voprosu ob opredelyayuşey roli kultiri v obshestvennom razvitii // Elmi əsərlər, BSU, 2006, №1, s.63-68
6. Declaration of Principles on Tolerance. Article 1.1

7. UNESCO Universal Declaration on Culural Diversity. Article 3
8. Zakaria, F. "Culture is Destiny – A Conversation with Lee Kuan Yew" p. 116.
9. Hüseynov S. Azərbaycanda dini tolerantlıq mədəniyyəti: tarix və müasirlik, Bakı, 2012
10. Armstrong K.A. History of God: The 4,000-Year Quest of Judaism, Christianity and Islam (1994)
11. http://shirvan.cls.az/front/files/libraries/2474/books/614985718.pdf
12. https://elar.urfu.ru/bitstream/10995/36192/1/978-5-7996-1629-8_2015.pdf

**Rəyçi: dos. Ş.Ağakişiyeva**

Göndərilib: 14.02.2022 Qəbul edilib: 13.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/44-48

**Aidə Məhəmməd qızı Cəlilzadə**
Naxçıvan Dövlət Universiteti
dissertant
jalilzadehaida@yahoo.com

# AMERİKA MEDİA DİSKURSUNDA İŞLƏNƏN BEYNƏLXALQ TƏŞKİLAT ADLARINI BİLDİRƏN ABREVİATURLAR

**Xülasə**

Məqalədə Amerika media diskursu və abreviasiyanın media diskursunda əhəmiyyəti beynəlxalq və dövlətlərarası təşkilat adları nümunəsində təhlil olunur. Aparılan təhlillər nəticəsində göstərilir ki, Amerika media diskursunda beynəlxalq təşkilat adlarını bildirən abreviaturlar ayrıca tematik qrup təşkil edir. Həmçinin vurğulanır ki, Amerika media diskursunda milli dövlət və özəl təşkilatların, eləcə də qeyri-dövlət təşkilatlarının adlarını bildirən abreviaturlar həm sayca çoxdur, həm də müxtəlifliyi ilə seçilir. Bu abreviaturlar ümumi abreviatur sisteminin əsas hissəsini təşkil edir.

Məqalədə nümunə kimi göstərilən təşkilat adlarının abreviaturları struktur-semantik və funksional baxımdan təhlil olunur. Britaniya media diskursu abreviaturları ilə Amerika media diskursu abreviaturları nümunələr əsasında qarşılaşdırılır. Onlar arasındakı oxşar və fərqli xüsusiyyətlər aydınlaşdırılır.

***Açar sözlər:*** *media diskursu, Amerika, beynəlxalq, təşkilat, abreviatura*

**Aida Mahammad Jalilzada**

## Abbreviations denoting international organization names used in the American discourse

**Abstract**

In the article American media discourse and the importance of an abbreviation in the media discourse are analyzed in the samples of international and intergovernmental organization names. It is expressed that international organization names used in the American discourse make a special thematic group. It is also mentioned that abbreviations denoting national government and private organization names as well as abbreviations of non-governmental organizations are greater in number and are also distinguished for their diversity. These abbreviations constitute the main part of the general abbreviation system.

The abbreviations of organization names given as examples are analyzed from structural-semantic and functional aspects. Abbreviations of British media discourse and American media discourse are contrasted with examples. The similarities and differences between them are clarified.

***Key words:*** *media discourse, America, international, organization, abbreviation*

## Giriş

İngilis dilində abreviasiya məhsuldar sözdüzəltmə üsullarından birinə çevrilmişdir. Yeni abreviaturların sayı bu dildə sürətlə artmaqdadır. Eyni zamanda abreviasiyadan istifadə etmək meyili də yüksəlir, müəllif abreviaturlarının mətndə işlənməsi intensivləşir. Bununla belə, abreviaturların düzəldilməsi konkret bir və yaxud bir neçə üsulla getmir. Abreviasiya məhsuldar sözdüzəltmə üsuluna çevrilsə də, onun vahid mexanizmi yoxdur. Nəticədə dildə abreviaturların müxtəlif tipləri əmələ gəlir, tiplərin bir-birindən fərqlənmə parametrləri çoxalır.

Müasir linqvistikanın mürəkkəb və mübahisəli anlayışlarından biri "diskurs" anlayışıdır. Meydana çıxmasının, elmi ədəbiyyatda yer almasının ilk dövrlərində diskurs mətnlə eyniləşdirilmişdir. Yəni "diskurs" və "mətn" eyni mənada işlədilmişdir. Media diskurs geniş əhatə dairəsinə malikdir. Bu onun mövzular çoxluğundan, eləcə də auditoriyasının böyüklüyündən irəli gəlir.

Abreviaturun media diskursundakı birinci başlıca rolu qənaət prinsipinin reallaşmasına kömək etməkdir. Abreviaturlar təkrar nominasiya vahidi kimi əvəz etdikləri tam formadan kifayət qədər qısa olur. İki, üç və daha çox komponentdən ibarət olan söz birləşmələri abreviaturların köməyi ilə bir sözlə əvəz oluna bilir. Uzun, tərkibində dilin orta söz dərinliyindən daha çox qrafemi və ya fonemi birləşdirən sözlər abreviaturların köməyi ilə qısaldılır, optimal formaya salınır. "*Qəzet və jurnallar yeni sözləri, söz birləşmələrini ən operativ şəkildə qeydə alan, istifadəyə buraxan vasitələrdir. Onlar yazılı nitqin başqa janrları ilə müqayisədə ictimai həyatın bütün sferalarında baş verən hadisələrə dərhal reaksiya verir, ümumişlək leksik qata daxil ola biləcək yeni sözləri qeydə alınma mənbəyi rolunu oynayır*" [1, 26].

Müasir dövrdə hər bir ölkənin özünün KİV vasitələri vardır və bu vasitələr arasında qəzetlər xüsusi yer tutur. Hazırda qəzetlərin həm də internet vasitəsilə yayılması da reallaşmışdır. Demək olar ki, hər bir qəzetin öz saytı fəaliyyət göstərir. İngilis dili dünyada qlobal dil funksiyasını yerinə yetirdiyinə görə, ingilisdilli qəzetlərin sayı kifayət qədər çoxdur. Qəzet və mətbuat sahəsində Böyük Britania və Amerika ön sıralarda gedir. İstər Böyük Britaniya, istərsə də Ametrika ingilisdilli qəzetləri dünyada yayılır, onların ayrı-ayrı ölkələrdə nəşr edilən buraxılışları da az deyildir.

Amerika media diskursunda beynəlxalq, eləcə də dövlətlərarası təşkilatların adlarını bildirən abreviaturlar ayrıca tematik qup təşkil edir və bu qrupa daxil olan abreviaturlar kifayət qədər çoxdur. Tematik qrupdan olan abreviaturlar qəzetlərin hər birinin istənilən nömrəsində qeydə alınır. Bu tematik qrupda əsas işlək olan abreviaturlar Birləşmiş Millətlər Təşkilatı və onun ixtisaslaşmış qurumlarının adlarını bildirənlər və NATO ixtisarıdır. Digər beynəlxalq təşkilatların adlarına qəzetlərin hər nömrəsində rast gəlinmir. Onların işlənməsi qəzetdə verilən yazının mövzusundan asılı olur.

Bu qəzetlərdə, məsələn, "The Herald Tribune" qəzetində U.N. abreviaturunun prototipinin məhsuldar işlənməsi müşahidə edilir.

Amerika media diskursunda milli dövlət və özəl təşkilatların, eləcə də qeyri-dövlət təşkilatlarının adlarını bildirən abreviaturlar həm sayca çoxdur, həm də müxtəlifliyi ilə seçilir. Bu abreviaturlar ümumi abreviatur sisteminin əsas hissəsini təşkil edir.

N.S.A. – National Security Agency inisial nöqtəli abreviaturdur. Prototipin komponentlərinin inisial qrafemlərindən əmələ gəlmişdir. Oxunuş hərflərin adları əsasında gedir. Yeri gəlmişkən, onu da qeyd edək ki, nöqtəli abreviaturlar hərfi oxunuşa malikdir. Nöqtə qrafemləri bir-birindən ayırdığına görə, oxunuş hərflərin adları üzrə gedir. N.S.A. abreviaturunun tam forması mətndə paralel işlədilir. Lakin bu işlətmə abreviaturun deşifrəsi məqsədi daşımır. Belə hesab etmək olar ki, N.S.A. Amerikada geniş oxucu kütləsinə məlum olan abreviaturdur. Ona görə də qəzetlərdə bu abreviaturun yanında və ya mətnin əvvəlində tam formanın işlədilməsinə ehtiyac duyulmur. Təbii ki, bu qəbul edilmiş qayda deyildir. Yazının müəllifi abreviaturun tam formasını diqqət mərkəzinə çəkə bilər. Bu baxımdan, abreviaturlar media diskurs dilini zənginləşdirən ən məhsuldar dil vasitələridir. Qəzet materiallarında hər dəfə yeni abreviaturlar işlədilir. Onların heç də hamısı dilin abreviatur sisteminin daimi fonduna daxil olmur. Bir çox abreviaturlar konkret mövzuda olan media diskursda istifadə olunur, sonralar bu abreviaturlar təkrar işlənmir.

Abreviasiya müəyyən obyektin, təşkilatın, birliyin, idarənin adının sərbəst ixtisar prosesidir. Ona görə də, abreviaturlar müəyyən mərhələdə neologizmlər kimi funksionallıq daşıyır. Media diskursda abreviaturların işlənməsi yüksək informativliyi ekspressivliklə, materialın yığcam təqdimatı ilə birləşdirir. Müasir ingilisdilli diskurslarda inisial-hərfi abreviaturlar çoxluq təşkil edir. Bu vahidlər mediamətndə seçilir. Onların əksəriyyəti böyük və ya baş hərflərlə yazıldığına görə, mətndə qabarıq nəzərə çarpır. Qəzet materialını sadəcə nəzərdən keçirtdikdə abreviaturlar diqqəti cəlb edir, oxucunu materialın həmin hissəsi üzərində dayanmağa sövq etdiri. Bu abreviaturlar media diskursda nominativ funksiyanı yerinə yetirir. Onlar üç və daha artıq sözdən ibarət olan adların əvəzləyici işarələri rolunu oynayırlar [2,12]. Belə əvəzləyici işarələrin müəyyən əksəriyyətinin funksiyası işləndikləri media diskursda tamamlanırsa, az olmayan başqa bir qismi isə geniş funksionallığa malik olur və bu funksionallıq işlənmə məkanı ilə sıx bağlılığa malikdir. Amerika media diskurslarında işlənən və bu ölkədəki dövlət strukturlarının, idarə və təşkilatlarının, ictimai birliklərinin adlarını əvəzləyən abreviaturlar ABŞ məkanında uzunmüddətli işləkliyi ilə seçilir. Ölkənin vətəndaşları, xüsusən də qəzet oxucuları həmin abreviaturların hansı tam formanı əvəz etməsini bilirlər. Müəyyən sayda Amerika

abreviaturu isə beynəlxalq miqyasda yayılmış və başqa ölkələrin media vasitələrində işlənir, onlar abreviatur lüğətlərinə, siyahılarına daxil edilir. İdarə və təşkilat adlarının təkrar nominasiya vahidləri olan abreviatur sistemində dəyişmələr baş verir. Bəzi abreviaturlar istifadədən çıxırsa, bir çox abreviaturlar yeni yaranır, media diskurslarda işləklik qazanırlar.

Amerika media diskursda abreviaturlar informasiya tematikasından asılı olaraq istifadə olunurlar. Qəzetin müəyyən nömrəsində işlək olan abreviatur növbəti nömrə və yaxud nömrələrdə qeydə alınmaya bilər. Belə bir mənzərənin tədqiqi eyni qəzetin ardıcıl nömrələrində işlənən abreviaturların siyahılarını tərtib edib onların müqayisəsini aparmağı aktuallaşdırır. Lakin bundan əvvəl Amerika diskursunda işlənən abreviaturların yuxarıda qeyd olunmuş məsələlərlə bağlı xüsusiyyətlərini aydınlaşdırmağa çalışaq.

"*On Sept. 19, the CWSC, owned by a devout Mennonite family, asked the Supreme Court to review a July ruling by the U.S.CA. for the third Circuit that rejected the company's argument that requiring contraception coverage in employee health plans violates First Amendment's free exercise clause and a federal law, the RFRA*". [3, 6]. Nümunədə üç abreviaturdan istifadə edilmişdir. Bundan əlavə, "Birth Control rules" adlanan məqalənin sonrakı hissəsində qeydə alınan abreviaturun (SC) tam forması da (the Supreme Court) bu nümunədə işlədilmişdir.

CWSC abreviaturun tam forması məqalə mətnində yoxdur. Qəzetin bu nömrəsindəki və bundan sonrakı beş nömrəsində həmin abreviaturun işlənməsi qeydə alınmır. Lüğət və internet axtarışlarından sonra abreviaturun tam formasını tapmaq mümkün oldu. CWSC – The Conestoga Wood Specialities Corporation. Abreviaturun semantikasından, onun hansı təşkilatın adını bildirməsindən aydın olur ki, o, işlək deyildir və dar sahəyə aid adı əvəz edir. Fikrimizcə, bu abreviatur yalnız kənar oxucuya deyil, "International Herald Tribune" qəzetinin fəal oxucuları üçün də naməlum ola bilər. Media diskursun ümumi məzmunu ilə tanışlıq göstərir ki, jurnalistin məqsədi abreviatur adla verilmiş təşkilatla bağlı geniş məlumatı oxucuya çatdırmaq deyildir. Burada Amerika məhkəmələrində işə baxılma, qərarların çıxarılması, onları appelyasiya və icrası problemlərini qabartmaq nəzərdə tutulmuşdur. Müəllifin məqalə mətnində CWSC abreviaturunun denotatını sonradan bir dəfə "the company" substitutu ilə verməsi də bu fikri təsdiq edir.

İllüstrativ materialdakı U.S.CA abreviaturunda diqqəti cəlb edən cəhət odur ki, o, abreviatur birləşməsidir və mürəkkəb abreviatur tərkibdəki ikinci abreviatur nöqtəsizdir. İlk baxışdan, belə nəticə çıxarmaq olar ki, ikinci komponent də nöqtəli verilsəydi. U.S.C.A. ixtisarı alınardı və onu bir abreviatur hesab etmək olardı. U.S. abreviaturunun tam forması məlumdur. CA – Court of Appeals. Tam formadakı iki söz bir-biri ilə of sözönü ilə əlaqələnir. Abreviaturda bu sözünün göstəricisi yoxdur. Nöqtəli abreviaturlarda abreviasiyaya məruz qalan sözlərin arasında dilin köməkçi sözlərinin yer alması azru edilən hal deyildir. Çünki "nöqtə" işarəsi sanki belə bir elementin yoxluğunu təsdiq edir. U.K. – United Kingdom, U.S. – United State, U.N. – United Nations, E.U. – European Union və s.

Amerika media diskursunda U.S. və U.S.A. abreviaturlarının paralel işlənməsinə rasst gəlinir. "*The gold medals have come in 10 sports, one more than the United States at nine, prompting articles on how Britain is "ahead" of U.S.A." O.K., the U.S. leads Britain on overall gold medals and British golds have included one in BMX (bike motocross) and one in taekwondo but hey*" [4, 6]. İki söz arasında sözönünün işlənməsi həmin sözlərin sintaktik bağlılığını daha çox gücləndirir. USA abreviaturunun tam formasında son iki söz arasında "of" işlənir: The United States of America. Fikrimizcə, tam formadakı sintaktik bağlılığın dərəcəsi nəzərə alınarsa, sözlər arasındakı köməkçi nitq hissəsi olduqda abreviaturun nöqtəli variant kimi verilməsi özünü doğrultmur. Buna baxmayaraq, Amerika media diskursunda qeyd olunan cəhət nəzərə alınmır. Məsələn, The Federal Bureau of investigations – F.B.I., The National Aeronautics and Space Administration – N.A.S.A. və s. The Oil-for-Food Programme – O.F.F.P. Bu abreviaturda *for* sözönünün inisial qrafemindən də istifadə edilmişdir.

*"…Unfortunately, leaders of the Republican-led Senate have said they're unlikely to take up a similar measure — even though it contains a sensible provision to require the F.B.I. to alert Immigration and Customers Enforcement officials if an undocumented illegal alien attempts to obtain a firearm."* [5]

Yuxarıda məhkəmələrin fəaliyyəti ilə bağlı verilmiş illüstrativ materialda R.F.R.A. abreviaturunun prototipi The Religious Freedom Restoration Act birləşməsidir. İnisial qrafemlərdən düzəlmə abreviatur olub hərflərin adları ilə oxunur. Abreviatur işlənmə tezliyinə görə məhsuldar deyildir.

Eyni illüstrativ materialı təşkil edən cümlə "On Sept. 19" konstruksiyası ilə başlayır və tərkibdəki "Sept." ixtisardır: Sept. – September. Amerika media diskursları üçün səciyyəvi cəhətlərdən bir ay adlarının, demək olar ki, həmişə ixtisar variantında verilməsidir. İxtisar qısaltma abreviasiya mexanizmi ilə düzəldilmişdir. Sözün birinci dörd qrafemi götürülmüş, digər hissəsi isə atılmışdır. Qısaltma modelli bu abreviatur da nöqtəlidir.

İngilis dilində ay adlarının ixtisar formaları Amerika ingilis dilində olduğu kimidir. Lakin Britaniya media diskursunda ay adları, bir qayda olaraq tam formada işlədilir:

"*What's on TV & radio this weekend: Saturday, March 5 and Sunday, March 6*" (6)

"*March is here, and the garden finally feels as if it's shaking off its winter coat of grey and brown, with daffodils emerging and blossom unfurling."* (7)

Amerika və Britaniya media diskurslarında rekursiv akronimlərə rast gəlinir. Rekursiv akronimdə abreviatur tam formanın, adətən, birinci komponenti olur.Visa International Service Association. Dörd komponentdən ibarət olan birləşmə inisial fonemlərdən təşkil olunan abreviaturla əvəz olunur – Visa.

Amerika media diskurslarında müxtəlif komissiyaların adlarını ifadə edən abreviaturlar da işlənir. "S.E.C. takes on celebrity investor in insider trading trial" [8, 17]. Məqalənin başlığında istifadə olunmuş abreviatur (S.E.C.) onun birinci abzasında tam formada verilmişdir: The Securities and Exchange Commission. Onu da qeyd etmək lazımdır ki, media diskursların başlıqlarında abreviaturların istifadə olunması halları artır. Sərlövhədə abreviatur onun uzunluğunu azaldır, başlığı qısa və yığcam edir. Başlıqlarda U.S., U.K. kimi dövlət adları ilə yanaşı, UBS, S.E.C., I.M.F., IHT, AWOL, SPINE, C.D.C., F.B.I və başqa abreviaturlar da işlənir.

İstər Britaniya, istərsə də Amerika media diskurslarında təşkilatın tipini ifadə edən ixtisarlardan istifadə olunur. Məsələn, plc – public limited company, ppl – Limited Liability Partnership, ltd – private limited company. Diskursda başqa ölkələrdən olan təşkilatların tipləri müvafiq dildə olduğu kimi verilir. Məsələn, S.a.r.l. – Société et responsabilité limitée (fransız), AG – Arbeitsgemeinchaft (alman), S.p.a – Sociata per azioni (italyan).

Amerika media diskursunda müxtəlif profilli idarə və təşkilatların, kompaniya və şirkətlərin adlarını ifadə edən abreviaturlar işlənir. Belə abreviaturları sahələr üzrə qruplaşdırmaq olar.

Banklar və bank sahəsində fəaliyyət göstərən qurumlara aid RBB – Retail and Business Banking, CDS – Credit Default Swap, PPI – payment protection insurance və s. Amerika media diskurslarında Almaniya və Britaniya banklarının abreviaturları işlənir. "*The Dute banks ABN Amro, now part of Royal Bank of Scotland, and ING Bank, The British bank HSBC is also under investigation by the U.S. authorities for suspected money-laundering violations connected to Cuba, Iran, Mexico, North Korea and Saudi Arabia, and the bank*" [9, 16].

Avropa Mərkəzi Bankının abreviaturu həm Britaniya, həm də Amerika media diskurslarında işləkdir: ECB – European Central Bank. Diskurslarda maliyyə və kredit, bank, ümumiyyətlə iqtisadi sahəyə aid terminoloji söz birləşmələrinin abreviaturlarından çox istifadə olunur. Məsələ ondadır ki, müasir dövrdə media iqtisadi, maliyyə və bank məsələlərinə aid xəbər və məlumatlara geniş yer ayırır. Qəzetlərin hər bir nömrəsində maliyyə bazarına aid müxtəlif məsələlərə, xüsusən valyuta məzənnələri, infilyasiyaya yazılar həsr olunur. Bu tipli media xəbərlərində maliyyə sahəsinə aid abreviaturlar işlədilir. Məsələn, Q.E.P. – quantitative easing for the people,

Primarily Wells Fargo, JPMorgan: Chase, Bank of America and U.S. Bancorp kimi bank adları da abreviaturlu birləşmələrə aiddir. Media diskurslarda onların prototipləri verilmir.

Tam formanın başlanğıc hissəsinin qısaldılması olan aferezis media diskurslarda az yayılmış abreviatur tipidir. Aferezis abreviaturlar əsasən iki, nadir hallarda birhecalı olurlar [10, 124]. Bu cür ixtisarlar danışıq dili üçün səciyyəvidir."He" və ondan sonra "to be" feilinin "is" forması işləndikdə danışıq dilində "E's" ixtisarı işlənir. Media diskursda onların istifadə olunması təsadüfi xarakter daşıyır və belə nümunələri tapmaq çətindir. T.Y.Sergeyeva Britaniyanın "Sunday Mirror" qəzetində aşağıdakı cümləni məqaləsində nümunə kimi vermişdir: "E's got time for everyone, has "Arry", says an adoring

Big Dave". Müəllif bu cümlədəki "Arry" sözünün Harry antroponiminin aferezisə uğramış forması olduğunu da qeyd etmişdir [11, 70-71]. Qeyd olunan forma Amerika media diskursunda qeydə alınmır.

## Nəticə

Amerika və Britaniya media diskurslarında işlənən təşkilat, idarə, şirkət, dövlət strukturu idarələrinin adlarını ifadə edən abreviaturların kifayət qədər çox omonim abreviaturlarının mövcudluğu faktını həmişə nəzərə almaq lazım gəlir. Abreviaturun konkret olaraq hansı adı bildirməsi kontekstə və diskursdakı tam formaya (əgər bu forma verilibsə) görə müəyyənləşdirmək və yaxud dəqiqləşdirmək mümkündür. Amerika media diskurslarında işlənən C.I.A. və F.B.I. abreviaturları da omonimlərə malikdir. Məsələn, C.I.A. – Canadian Imports Association; C.I.A. – Central Intelligence Agency. *"1967: Business Leaders Involved in Covert C.I.A. Operations"* (12)

Hər iki abreviaturun yazılışı, eləcə də oxunuşu [si: ai ei] eynidir, lakin onlar fərqli təşkilatları bildirir. Media diskurslarda qeyd olunan abreviaturlar Central Intelligence Agency və Federal Bureau of Investigations mənalarında işləkdirlər. Sonuncu söz birləşməsi deşifrə edildikdə ondakı cəm şəkilçisi atılır. Tam formada sonuncu söz cəm formasında (Investigations) olsa da, o, tək kimi qəbul edilir.

İngilis və Amerika media diskursunda sözün orta hissəsinin ixtisarı (sinkopa) daha çox müşahidə olunur. Ümumiyyətlə, Britaniya və Amerika media diskurslarında abreviaturlarla bağlı spesifik xüsusiyyətləri müxtəlif tematik qruplara daxil olan ixtisarlar əsasında təhlil etmək daha məqsədəuyğundur.

## Ədəbiyyat


1. Cf.V.G. Kostomarov (1971) Russki jazyk na gazetnoj polose, Moscow: Izd. MGU, s. 26
2. Kumanşina E. İ. Lingvokreativniy aspekt anqloyaziçnoy massovoy kammunikaçij:yazikovaya igra v britanskix i severoamerikanskix masmedia: avtoref. dis. … kand. filol. nauk. /E.İ.Kumanşina –Volqaqrad, 2006 -26 s.
3. International Herald Tribune, 01.10.2013, p.6
4. International Herald Tribune, 10.08.2012, p.6
5. International Herald Tribune//For consistent gun sale background checks (heraldtribune.com)// 01.03.2019
6. https://www.thetimes.co.uk Saturday March 05 2022, 12.01am GMT, The Times
7. https://www.thetimes.co.uk/article/what-to-do-in-the-garden-in-march Friday March 04 2022, 5.00pm GMT, The Sunday Times
8. International Herald Tribune, 01.10.2013, p.17
9. International Herald Tribune, 10.08.2012, p.16
10. Arnold, I. V. Leksikologia sovremennovo anqliyskovo yazika// I.V. Arnold-Moskva: Visshaya shkola, 1986, s.124
11. Sergeeva, T.S. Abreviaturi v sovremennikh anglojazichnikh tekstakh massovoj informachii // Philologicheskie nauky. Voprosi teorii i praktiki. Tambov. Qramota, 2013. №6, p.11.-p. 174-179 (s. 70-71)
12. 1967, Business Leaders Involved in Covert C.I.A. Operations//
13. https://iht-retrospective.blogs.nytimes.com/2017/02/17/1967-business-leaders-involved-in-covert-c-i-a-operations/ International Herald Tribune, 17.02.2017


**Rəyçi: prof. İ.Tahirov**

Göndərilib: 16.02.2022 Qəbul edilib: 15.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/49-53

**Ülvüyyə Şirzad qızı Hüseynova**
Bakı Dövlət Universiteti
dissertant
ulka.huseyn1011@mail.ru

# İNVEKTİV LEKSİKANIN TƏSNİFİ MƏSƏLƏSİ

**Xülasə**

Məqalədə əsasən invektiv leksika və onun işlənmə xüsusiyyətləri araşdırılır. İnvektiv leksikada etiket normalarının kobud pozulması halları, emosional əlaqə, nitq aktlarının işlənməsi istiqamətində xüsusi araşdırmalar aparılmışdır. Kütləvi İnfotmasiya Vasitələridə mənfi emosiyaların dil vasitəsilə verballaşması mısələsi xüsusi araşdırılmışdır. Məqalədə nümunələr göstərməklə invektiv leksikanın təyin olunması meyarları müəyyınləşdirilir.

***Açar sözlər:*** *leksika, invektiv leksika, vulqarizm, loru sözlər, qeyri-normativ sözlər*

**Ulviya Shirzad Huseynova**

## Classification of invective lexis

**Abstract**

The article reveals with the means of creating invective vocabulary. The invective vocabulary often leads to language aggression, creating rude stylistically substandard type of speech behavior. Special attention is paid to the functions of creating invective vocabulary and means of exercising verbal aggression in mass media. The paper gives examples, and also a thorough analysis of the usage of invective vocabulary, being created in context.

***Key words:*** *lexicon, invective vocabluary, vulgarism, dialects, non-normative words*

Leksik sistemin vahidi olan söz müxtəlif aspektlərdən tədqiq edilir. Sözün işlənmə dairəsi, müxtəlif funksional üslublarında fəallığı, həmçinin onun işlənməsinə məhdudiyyətin qoylması və ya məhdud işləkliyi tədqiqat üçün xüsusi maraq doğurur. Buna baxmayaraq, sözün işlənməsinə məhdudiyyət qoyulması, bu məhdudiyyətlərin linqvistik və ekstralinqvistik olması, istifadəsinə məhdudiyyət qoyulan sözlərin hansı kommunikativ sferada işlənməsinə aid araşdırmalar, xüsusən də Azərbaycan dilinin materialları üzrə aparılmış işlər çox azdır.

Obyektiv gerçəklikdə mövcud olan bütün predmetlər, hadisələr nominasiya olunur, adlandırılır. “Söz bizi əhatə edən aləm haqqında bilikləri özündə ehtiva edir, toplayır, qoruyur. Sözlər millətin keçmişinin və bugününün güzgüsüdür, xalqın həyat tərzini anlamağın açarıdır” [1, s.3].

Dilin lüğət tərkibini təşkil edən sözlərin kommunikasiya prosesində istifadə olunması eyni deyildir. Tezlik xarakteristikalarında fərqlilik müxtəlif səbəblərlə bağlı olur. Sözlərin söyləm və mətn daxilindəki funksionallığı onların mənaları, dilin ümumişlək leksik qatına, yaxud passiv fonda aidliyindən də aiddir. Sözlər fəal və qeyri-fəal olmaqla iki yerə ayrılırlar. Qeyri-fəal sözlər məhdud şəkildə istifadə olunur.

İşlədilmə dairəsinə görə sözlər qruplara bölünür. Ə.Dəmirçizadə lüğət tərkibini təşkil edən sözləri iki hissəyə bölmüşdür: ümumişlək sözlər və xüsusi sözlər. Xüsusi sözlərə o, terminləri, jarqon və arqo sözləri, dialektizmləri, arxaik sözləri və neologizmləri daxil etmişdir [2, s.78-79]. Bu bölgünün əsasında fərqli meyarlar durur. Məsələn, dialektizmlər dialekt sözləri olub dialektə mənsubluqla təyin olunursa, arxaik sözlər dilin müasir dövründə işləkliyini itirməsi, köhnəlməsi ilə təyin olunur. Arxaikləşmə sözün ifadə etdiyi denotatın istifadədən çıxması və ya aktual olmaması ilə bağlı xüsusiyyətdir. Dilin lüğət tərkibində başqa söz qrupları da vardır. Məsələn, S.Cəfərov işlənmə dairəsinə görə bölgü verərkən loru sözlər və vulqarizmlərə də yer ayırmışdır [3, s. 66]. V.Kuxarenko isə lüğət tərkbini neytral, bədii və danışıq dilində işlənən söz qruplarına ayırmışdır. Bədii qata o, arxaizmləri, varvarizm və əcnəbi sözləri, terminləri, neologizmləri, danışıq dili qrupuna isə, slenqləri, vulqarizmləri, jarqonları, peşə-sənət

sözlərini, dialektizmləri daxil etmişdir [4, s.7-8]. Bu cür bölgünün əsasında hansı meyarın durmasını təyin etmək çətindir. Çox güman ki, müəllif belə ayırma məqsədilə bədii dil və danışıq dili materiallarında sözün işlənməsini araşdırmalı olmuşdur. Belə olan halda lüğət tərkibindəki neytral sözlərin seçilməsi meyarları təyin etmək olmur.

A.Moroxovski və O.Vorobyova isə öz tədqiqatlarında ingilis dilinin lüğət tərkibini: 1) yüksək üslubi tona məxsus sözlər: poetizmlər, arxaizmlər, varvarizmlər və əcnəbi sözlər; 2) qeyri-ədəbi danışıq dili: kollokvualizmlər, dialektizmlər, vulqarizmlər, jarqon sözlər və slenqlərə bölmüşlər [5, s.101-117]. Bölgüdə varvarizmlərin hansı səbəbdən yüksək üslubi tona məxsus olmasını aydınlaşdırmaq çətindir. Qeyri-ədəbi danışıq dilində kollokvualizmlərin yer alması təbii haldırsa, dialektizmlərin bu qrupa salınması bir qədər mübahisə doğurur.

Lüğət fondunun aktiv və passiv laylara alınması işləkliklə bağlı məsələdir. Passiv leksikada da xalqların həyat tərzi, adət-ənənələrinin izləri özünü qoruyur, bu sözlər də müəyyən semantikaya malikdirlər. Passiv lüğət fonduna münasibətini V.M.Şanski belə ifadə etmişdir: "Dilin leksikasının müasir vəziyyətini sistem kimi təyin etməyən, onun adi, gündəlik istifadə olunmayan ünsür təsiri bağışlayan, ya yeni olub orada qərarlaşmış, ya da nitq prosesi üçün zəruriliyini itirmiş sözlər passiv lüğət fonduna aiddir" [6, s.142]. Eyni məsələyə H.Həsənov öz münasibətini bildirmiş, sözləri aktiv və passiv olmaqla iki yerə bölmüş və bundan sonra aktiv sözlərin də iki tipini fərqləndirmişdir: 1) ümumxalq sözləri: ümumişlək, danışıq, loru, kitab, poetik və rəsmi sözlər; 2) məhdud dairədə işlədilən sözlər: dialektizmlər, peşə-sənət sözləri, terminlər, jarqon sözlər, arqo sözlər [7, s. 111]. Göründüyü kimi, müəllif köhnəlmiş sözləri və neologizmləri passiv lüğət fonduna aid etmişdir.

B.Xəlilov işlədilmə dairəsinə görə fərqlənən sözlərin təsnifi məsələsinə fərqli şəkildə yanaşmış, əvvəlcə dilin lüğət tərkibində olan sözləri hamının başa düşdüyü və məhdud dairədə işlədilən sözlər şəklində ayırmış, ikinci qrupa dialektizmləri, arxaizmləri, neologizmləri, vulqarizmləri, loru sözləri, jarqon və arqo sözlərini aid etmişdir. Müəllif bundan başqa xüsusi sözlər qrupunu ayırmış, terminləri və peşə-sənət sözlərini ora daxil etmişdir. Nəhayət, alınmaları mənşəcə fərqlənən qrup adlandırmışdır [8, s.26]. Fikrimizcə, sözlərin hamı tərəfindən başa düşülməsi ilə məhdud dairədə işlənməsi fərqləndirmə meyarı ola bilmir. əvvəla hamı tərəfindən başa düşülmə meyarı yayğındır. Məhdud dairədə işlənən sözlər də dil daşıyıcılarına məlum olan sözlərdir. Ümumişləklik dildə sözlərin fəal işlənməsini nəzərdə tutur. Bununla yanaşı, xüsusi sözlər qrupundakı terminlər, peşə-sənət sözlər də məhdud dairədə işlədilir.

A.Qurbanov əsas və əlavə sözlər qruplarından bəhs etmişdir. Əsas sözlərin zəruri əşya və məfhumların, hadisələri ifadə etməsi fikrini irəli sürən müəllif, əlavə sözlər qrupuna dialektizmləri, arxaizmləri, loru sözləri, vulqarizmləri, dar sahə terminlərini, peşə-sənət sözlərini və s. daxil etmişdir [9, s.195]. Əsas və əlavə sözlərə ayırma dilin leksik sisteminin fəaliyyətini əks etdirə bilmir. Sözün ən zəruri məfhum və hadisəni bildirməsi ümumi fikirdir. Dil üçün zəruri və ən zəruri olan yoxdur. Dil hər cür kommunikasiyanı reallaşdıra bilməli və bunun üçün onun lüğət fondunda lazım gələn sözlər olmalıdır. Sözlər zəruriliyə və qeyri-zəruriliyə görə yaranmır.

Məlumdur ki, danışıq dilində işlədilən, ədəbi dilin leksikasına aid edilməyən sözlər loru sözlər adlandırılır. Bunlar ədəbi dilin sözləri olmasa da, bədii ədəbiyyatda personajların dilində işlənir. Loru sözlərdən istifadə edilməsi ədəbi dil normalarını həmiş pozmur. Onların işlənməsi nitq situasiyasından və eləcə də danışanın nitq səriştəsindən asılıdır. Loru sözlər məişət leksikasının tərkib hissəsi kimi çıxış edir.

Loru sözlər ekspressiv-emosional sözlər qrupuna daxildir. Onları xüsusi loru sözlər və vulqar sözlər kimi iki qrupa ayırmaq olar. Xüsusi loru sözlərin ekspressivlik daşımadığı və kobud sözlər sırasına daxil olmadığı qeyd olunmalıdır. Vulqar sözlərdə kobudluq, etikanın pozulması güclüdür. Məişət danışığında loru sözlərin çox işlənməsi bu danışıq tipinin kobudluğunun göstəricisi deyildir. Danışıq dilində emosionallıq və ekspressivlik daha güclü olur. Kommunikasiya prosesində iştirak edən kommunikantların bir-birinə münasibəti, danışıq mövzusu, tərəflərin maraq dairəsi sözlərin süçilməsinə təsir göstərir. Belə hallarda kommunikantların nəzakət qaydalarını pozması və bir-birinə münasibətdə neqativ emosional qiymətləndirmə ifadə edən sözləri nitq aktlarına daxil etməsi hadisəsi baş verir. Nitq situasiyası elə ola bilər ki, kommunikasiya iştirakçıları ədəbi dil üçün səciyyəvi olmayan söyüş və qarğışları da dilə gətirir, bir-birini təhqir edirlər. Vulqar sözlərdə kobudluq, nəzakətsiklik, təhqir, alçaldıcı münasibət ifadəsini tapır [7, s. 201].

Vulqar sözlərin elə bir qrupu da vardır ki, onların istər yazılı, istərsə də şifahi nitqdə işlədilməsi qadağan hesab edilir. Belə sözlər tabular da adlandırılır. Tabular cəmiyyətdə qəbul edilmiş ictimai və sosial normalarla müəyyənləşir. Lakin bu o demək deyil ki, belə sözlərin qəbul edilmiş müəyyən siyahısı vardır. Cəmiyyətdə sosial davranış və nitq davranışı normaları hökm sürür. Bu normalar konkretləşdirilmiş, elan edilmiş olmasa da, mövcud normalardır. Cəmiyyət üzvləri nitqlərində vulqar sözlərdən istifadə etmirlər. Bununla belə, tərbiyə və digər amillərdən asılı olaraq bəzi adamlar mövcud davranış normalarına, milli-mədəni ənənələri nəzərə almır və bu onların nitq davranışına da təsir göstərir.

Kommunikasiya prosesinin iki tərəfi vardır. Bir iştirkçı adresantdırsa, digəri adresatdır. Adresantın nitqində vulqar sözlər istifadə olunursa, o, nitq davranışı şərtlərini pozur. Əgər vulqar sözlər bilavasitə adresatın özünə ünvanlanırsa, onda adresant ona qarşı kobudluq edir. Vulqar sözlər və onların daxil olduğu söyləmlər təhqiredici, alçaldıcı olduqda kommunikasiya iştirakçıları arasındakı münasibətlər sistemində kəskin dəyişmələr baş verir. Kommunikasiyada istifadə olunan sözlərə bu münasibətlər sistemindən yanaşdıqda onların daha iki qrupunu fərqləndirmək olur. Bu qruplardan biri invektiv leksika, digəri isə qeyri-invektiv leksika adlandırılır.

İnvektiv leksika adresatı təhqir edən, alçaldan leksikadır. Qeyri-invektiv leksika tərkibində adresata ünvanlanmış neqativ qiymətləndirmə, emosional-ekspressiv komponent olan leksikadır. Frazeoloji vahidlərdə də invektivlik ola bilər. Ümumiyyətlə, semantikasında ekspressiv çalar və adresatın şəxsiyyətini təhqir, biabır edən məna olan söz və ifadələr invektivlər adlandırılır. İnvektiv leksikanın adresata kobud, alçaldıcı, ədəbsiz formada ünvanlanması da onun dəyərləndirilməsində əhəmiyyətli rol oynayır.

İnvektiv leksikanın ədəbi və qeyri-ədəbi qruplarını ayırmaq olur. İkinci jarqon leksikası, dialekt sözləri, eləcə də söyüşlər də aid edilir.

Dilin lüğət tərkibinə daxil olan sözlər arasında emosional-ekspressiv qiymətləndirmə leksikasını ayırmaq da lazım gəlir. Bu leksikanı ayırmaq üçün ekspressivlik kateqoriyasından istifadə olunur. Müasir dilçilikdə ekspressivlik mürəkkəb və qeyri-müəyyənliyə malik problemlərdən biri hesab edilir. Ekspressivliyin tədqiqat sahələri üslubiyyat, semantika və nitq praqmatikası hesab olunur[10, s.7].

Ekspressivlik linqvistik hadisə hesab olunsa da, onun təyin edilməsi üsulları psixoloji təsirlə əlaqəsinə görə, sistem-struktur linqvistika çərçivəsindən kənara çıxır. Nitq subyektinin ifadə olunanla bağlı hansı hissi –neqativ və ya pozitiv hissi keçirməsi müsbət və mənfi ekspressiya ilə əlaqələnir. Bəzi tədqiqatçılar invektiv leksikanın emosiyanı, yaxud təhqiri ifadə etməsini ayırd etməyin zəruri olduğnu qeyd edirlər. İnvektiv leksikanın adresatı təhqir etməsi və danışanı, daha dəqiq desək, invektiv leksikadan istifadə edəni neqativ səciyyələndirdiyini qəbul etmək olar. Burada invektiv leksikanın cəmiyyət arasında istifadə edilməsinin neqativ hadisə sayılması əsas götürülür. Daha bir məsələ odur ki, ekspressivliyin meydana çıxmasının özünün müəyyən səbəbləri olmalıdır. Yəni ekspressiya öz-özünə deyil, müəyyən təsir əsasında meydana çıxır, yaranır, ekspressiya kommunikativ situasiyadan da asılıdır. Danışanın/dinləyənin niyyəti, onların kommunikasiyaya qoşulma prosesindəki ilkin bilik və təsəvvürləri, eləcə də kommunikasiya aktının linqvistik və ekstralinqvistk konteksti ekspressiyanın yaranmasında rolu vardır.

İnvektiv leksikayaya dair tədqiqatlarda nitq mədəniyyətinin aşağı düşməsinin invektiv leksikadan istifadənin artması ilə düz mütənasib olması göstərilir. Aşağı səviyyəli nitq mədəniyyəti situasiyası ilə davam edən kommunikasiya aktı ümumi mənəvi-əxlaqi dəyərlərin itirilməsi, nitq davranışında tolerantlığın pozulması kimi dəyərləndirilir.

İnvektiv leksikanın tərkibinə müxtəlif kobud, ədəbsiz, etikadan kənar olan sözlər daxil olur. Bu sözlərin bir qismini tabular təşkil edir ki, onların cəmiyyət arasında səsləndirilməsi, kiməsə ünvanlanması qəbul edilmiş sosial normaları pozur. Bu cür sözlər çox istifadə olunan lüğətlərə, bəzi dillərdə isə ümumiyyətlə heç bir lüğətə daxil edilmir. Ona görə də, elmi ədəbiyyətda invektiv leksika anlayışının təyininə həm dar mənada, həm də geniş mənada yanaşmalar müşahidə edilir, invektivlərin fərqli təsnifləri aparılır. Dar mənada invektiv leksika təhqir növü adlandırılır. Geniş mənada isə invektivlər verbal təcavüz kimi qiymətləndirilir. Təhqir və verbal təcavüz anlayışları yalnız leksik səviyyə ilə məhdudlaşdırıla bilməz. Çünki hər hansı sözün mövcudluğu özlüyündə nə təqir, nə də verbal təcavüzlə bağlı deyildir. Hər

iki hadisə ünvanlanma, eləcə də saymamazlıqla əlaqələdir. Əgər invektiv leksika kiməsə ünvanlanırsa və predikativ konstruksiya ilə canlandırılırsa təhqir və saymamazlıq faktları üzə çıxır. Cəmiyyət üzvləri arasında invektiv leksikaya aid ədəbsiz sözlər işlədildikdə və bu sözlər konkret olaraq bu üzvlərdən heç birinə ünvanlanmırsa, bu halda eşidənlər, dinləyənlər saya alınmır, onlara hörmətsizlik edilir. Başqa halda birinə qarşı ünvanlanmış ədəbsiz söz başqalarının, kənar şəxslərin yanında dilə gətirilirsə, onda həmin sözün ünvanlandığı şəxs təhqir edilir, bu prosesin başvermə məqamında iştirak edən kənar şəxslərə isə hörmətsizlik baş verir. Beləliklə, invektiv leksikanın nitqdə işlənmə situasiyası bu leksikanın qiymətləndirilməsində rol oynaması faktı təsdiqini tapır.

İnvektiv leksikanın söz səviyyəsində təsnifi də xüsusi önəm daşıyır. Bu, invektiv leksik qatı təşkil edən sözlərin müəyyən prinsiplər üzrə qruplaşdırılmasıdır. Rus dilçiliyində invektivlərin aşağıdakı qrupları fərqləndirilir: 1) ana söyüşləri, ədəbsiz sözlər; 2) üslubi neqativ sözlər (slenqlər, jarqonlar, vulqarizmlər, loru sözlər, dialektizmlər); 3) kobud, loru, söyüş sözləri; 4) mənfi qiymətləndirmə və nifrət modallığına malik ədəbi leksika [11, s. 84].

Məlumdur ki, ümumi emosional vəziyyəti və neqativ münasibəti ifadə etmək məqsədilə dildə insanı başqa predmet və obyektlərlə eyniləşdirmə səciyyəsi daşıyan nitq aktlarından istifadə olunur. Məsələn, *qoyun, eşşək, kötük, ilan, həşarat, soxulcan, öküz, mal, heyvan, tülkü və s.* Ayrılıqda götürüldükdə bu sözlər dilin ümumişlək leksik qatına daxil olan, müəyyən denotatları ifadə edən sözlərdir. Onların hər biri lüğətlərə daxil edilir və nitqdə istifadə edilir. Lakin bu cür leksik vahidlərin eyniləşdirmə üçün istifadə edilməsi başqa məzmun kəsb edir, insanı təhqir edir, onu alçaldır və s. bu cür hallarda invektiv leksika konkret fərdə ünvanlanır, fərdə müəyyən neqativ keyfiyyət şamil edilmiş olur. Belə ifadələrin linqvistik təhlili onların universal mədəni dəyər daşıması, qəzəbi, düşmənçiliyi, nifrəti ifadə etməsi faktlarını aşkara çıxarır.

İnvektiv leksikaya münasibətdə terminoloji sistemdə qeyri-sabitlik, qeyri-dəqiqlik müşahidə olunur.İnvektiv leksika "qeyri-normativ leksika","loru sözlər","vulqarizm", "kentizm", "slenqizm", "jarqonizm", "arqotizm", "sosial dialekt", "sosiolektizm","kollokvializm", "invektivizm", "invektiv sözlər", "invektiv leksika", "kobud sözlər", ədəbsiz sözlər", söyüş sözləri", "söyüşlər" kimi terminlərlə ifadə edilir ki, bu da terminoloji baxımdan qarışıqlıq əmələ gətirir. Şübhəsiz ki, qeyd edilən terminoloji variativlik yalnız terminologiyanın deyil, ümumilikdə linqvistikanın həllini tapmamış probllemlərindən biridir. Bu problemin həlli, ilk növbədə, "invektiv leksika", "qeyri-normativ sözlər", "substandart vahidlər" anlayışlarını təyin etməyi və bundan sonra invektiv leksikanın təsnifini tələb edir. Sonuncu məsələ qeyri-standart leksikanın nıvlərini təyin etmək kimi də qəbul edilə bilər.

İnvektiv leksikanın təsnifi məsələsinin qoyuluşu yeni olmasa da, həllini tapmamış, aktual problemlərdən biridir. İnvektiv leksikanın təsnifi üçün onu əvvəlcə iki qrupa ayırmaq lazım gəlir: 1) ədəbi dilə daxil olan invektiv leksika; 2) ədəbi-dilə daxil olmayan leksika. Hər iki qrupa daxil olan leksika yarımqruplara bölünə bilir. Ədəbi dildə işlənən invektiv leksikanın aşağıdakı yarımqruplarını ayırmaq mümkündür: 1) şəxsin cəmiyyətin münasibəti baxımından neqativ fəaliyyət, məşğuliyyət, davranış sahibi kimi adlandırılmasını reallaşdıran leksik vahidlər (oğru, bandit, quldur, fırıldaqçı, cibgir, başkəsən, rüşvətxor və s.); 2) şəxsin neqativ fəaliyyət, məşğuliyyət sahibi olmasının ekspressiv çalarla nominasiya edilməsi vahidləri ( xain, satqın və s.); 3) şəxsin vəzifə və peşəsinə görə neytral nominasiya edən leksik vahidlər (bürokrat, məmur, qəssab, alverçi və s.); 4) adresatın neqativ qiymətləndirilməsi üçün istifadə olunan zoosemantik metaforalar (madyan, eşşək, donuz, qoyun, köpək və s.); 5) şəxsi kiməsə və ya nəyəsə aid neqativ keyfiyyəti ifadə edən sözlə adlandırmada istifadə edilən sözlər (jaltaq, cibəgirən, ikiüzlü və s.); 6) neqativ mənalı kobud sözlər (əclaf, səfeh, əbləh və s.). Fikrimizcə ayırdığımız bu altı qrup, ədəbi dildə işlənən invektiv leksikanın bütün qruplarını əhatə etmir. Eyni zamanda bu qruplara daaxil olan sözlərin təhlili invektivləri yalnız leksik vahidlərlə məhdudlaşdırmağın düzgün olmadığı da aşkara çıxarır. Söz birləməsi və frazeoloji vahid şəkilli invektivlər də az deyildir.

İnvektivlər dünyanın dil mənzərəsinin nüvəsini təşkil edən konseptlərlə birbaşa bağlılığa malik olub xalqın çoxəsrlik həyat təcrübəsindən qaynaqlanan vahidləri əhatə edir. Dilin invektiv leksik qatında leksikaya aid proseslər gedir. Bəzi invektivlər köhnəlir, arxaikləşir, yeniləri yaranır. Dil başqa dillərdən invektivlər ala bilir və bu da alınma invektiv leksik qatının mövcudluğunu təsdiq edir.

İnvektiv leksika bütün dilərdə mövcud olub leksik səviyyədə dil universalisi sayıla bilər.

İngilis dilində vulqarizmlər iki əsas qrupda birləşdirilir: 1) qarğış və andlar; 2) söyüşlər [12, s.206-207]. Təbii ki, birinci qrup vulqarizmləri birbaşa invektiv leksika qrupuna daxil etmək olmaz. Andlar üçün invektivlik səciyyəvi deyildir. Lakin andlar invektivin ünvanlandığı sintaktik konstruksiyalarda və yaxud onların yaxın ətrafında işləndikdə invektivlik dərəcəsini artırır. Bu cəhət invektivlik dərəcəsi anlayışını daxil etməyə imkan verir. Şəxsin təhqir olunması ilə onun hərəkətinin, fəaliyyətinin neqativ qiymətləndirilməsi arasında fərq vardır. Ona görə də, invektivlərin bəziləri yalnız neqativ qiymətləndirməyə xidmət etdiyi halda, bəzilərinin birbaşa təhqir kimi qəbul edilə bilir. Lakin bu hallar və invektiv leksikanın bu cür tısnifi haqqında tədqiqatlar, demək olar ki, az aparılmışdır. İnvektiv leksikanın qeyd olunan semantik xüsusiyyətləri hüquqşünaslıqda daha çox araşdırılır. Hüququda şəxsin şərəf və ləyaqətinin alçaldılması, onun təhqir olunması kimi halların təyini zamanı invektiv leksikanın semantik xüsusiyyətləri ön plana çəkilir və müxtəlif aspektlərdən təhlil edilir. İnvektivlərin ekspressiv sözlər qrupuna daxil olması faktı da bu cəhətdən özünü aşkar göstərir. Tədqiqat üçün daha bir maraqlı cəhət invektivlərin emosional gərgin vəziyyətdə işlədilməsinin daha geniş yayılması ilə bağlıdır.

İnvektivlərin daha düzgün təsnifi məqsədilə, hər şeydən əvvəl, onların toplanması tələbini ortaya atır, Bəzi dillər üçün invektiv leksika, qeyri-normativ sözlər lüğətləri tərtib olunmuşdur. Bu cür lüğətlər invektiv leksikanın tədqiqi və təsnifi üçün əsaslı material bazası sayıla bilər.

## Ədəbiyyat

1. Slovari i linqvostranovedeniye. M.: 962, 667 s.
2. Dəmirçizadə Ə.M. Azərbaycan dilinin üslubiyyatı. -Bakı: Azərtədrisnəşr, 1962, 268 s.
3. Cəfərov S.A. Müasir azərbaycan dili (leksika). - Bakı: Maarif, 1970, 235 s.
4. Kukharenko V. Seminars in Style. -Moscow: Higher School Publishing House 1971, 183 p.
5. Moroxovskiy A.N., Vorobyova A.N., Lixosherst N.İ. Stilistika anqliyskoqo yazıka. Kiyev, Visha shkola, 1984, 247 s.
6. Shanskiy N.M., Leksikologiya sovremennoqo russkoqo yazıka. M.: Nauka, 1972, 364 s.
7. 7.Həsənov, H.Ə. Müasir Azərbaycan dilinin leksikası. - Bakı: Maarif, 1988, 306 s.
8. Xəlilov, B.Ə. Müasir Azərbaycan dilinin leksikologiyası.- Bakı: Nurlan, 2008, 441 s.
9. Qurbanov A.M. Müasir Azərbaycan ədəbi dili. I cild. -Bakı: Maarif, 2003, 438 s.
10. Teliya V.N. Chelovecheskiy faktor v yazıke: Yazıkovıye mekhanizmı expressivnosti. M.: Nauka, 1991, 214 s.
11. Jilvis V.İ. Pole brani. Skvernosloviye kak sosialnaya problema v yazıkaö i kulturakh mira. M.: Ladomir, 2001, 349 s.
12. Hajiyeva U.D. A Guide to English Stylistics. - Baku: ASPU, 2010, 341 p.

**Rəyçi: prof. A.Abbasov**

Göndərilib: 13.02.2022 Qəbul edilib: 14.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/54-58

**Araz Səlimxan oğlu Bədəlov**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
araz.badalov36@gmail.com

# KREDİT ANLAYIŞI VƏ ƏHALİNİN KREDİTLƏŞMƏSİNİN İQTİSADİYYATDA ROLU

**Xülasə**

İstehlak kreditləri günümüzdə ən aktual olan kreditin təzahür formalarından biridir. Bəzi hallarda istehlak kreditləri ilə bank kreditləri anlayışları eyniləşdirilir və yaxud da qarışdırılır. Lakin bu iki anlayış arasında kəskin fərqlər mövcuddur. Belə ki, istehlak kreditləri əhalinin ayrı-ayrı təbəqələrinin, fiziki və hüquqi şəxslərin zəruri ehtiyaclarını ödəmək məqsədilə verilən kredit növüdür. Bu forma istər pul formasında, istərsə də hər hansısa bir əmtəənin satın alınmasında iştirak edə bilər. Bu səbəbdən də istehlak kreditlərinin subyekti kimi yalnız banklar deyil, eyni zamanda da bank olmayan kredit təşkilatları və alış-veriş əməliyyatlarını həyata keçirən hüquqi şəxslər də çıxış edə bilər.

***Açar sözlər:*** *əhalinin kreditləşməsi, kredit əməliyyatları, kreditin funksiyaları, iqtisadiyyat, istehlak kreditləri*

**Araz Salimchan Badalov**

## The concept of credit and the role of crediting in the economy

**Abstract**

Consumer loans are one of the most relevant forms of credit today. In some cases, the concepts of consumer loans and bank loans are equated or confused. However, there are sharp differences between these two concepts. Thus, consumer loans are a type of credit provided to meet the needs of certain segments of the population, individuals and legal entities. This form can be used in the form of money or in the purchase of any commodity. For this reason, not only banks, but also non-bank credit organizations and legal entities engaged in purchasing operations can act as subjects of consumer loans.

***Key words:*** *population lending, credit operations, credit functions, economy, consumer loans*

## Giriş

"Kredit" anlayışı latın sözü olana graditam-gradere sözlərindən əmələ gəlib, hərfi mənası etimadetmə və ya inanma deməkdir. Məhz kredit ifadəsinin mahiyyəti də onun sırf ifadə etdiyi anlamla əlaqəlidir. Belə ki, kredit pul vəsaitlərinin müəyyən faiz qarşılığında bir şəxsdən digərinə etibar olunmasıdır. Başqa sözlə ifadə etsək, kredit pulun müəyyən faiz qarşılığında gələcək dövrlərdə ödənməsi və etimad prinsipləri üzərində qurulmasını təmin edən tədiyyə formasıdır. Burada önəmli olan kredit alanın aldığı krediti ödəmək arzusu ilə yanaşı, həmçinin də götürmüş olduğu kreditin dəyərində və yaxud da bu dəyərdən daha yüksək məbləğdə təminatının olmasıdır. Dediklərimizdən belə nəticə çıxara bilərik ki, kredit etimad əsasında qurulan və müəyyən bir təminata əsaslanan əməliyyatdır. Kredit cari dövr ərzində əldəki pul vasitəsilə gələcək dövrlərdə ələ keçəcək pulun mübadilə formasıdır.

Kredit əməliyyatlarının iki tərəfi- krediti verən və alan tərəfləri olur. Kredit verən ödəmə vədi alaraq pul vərən tərəf, kredit alan isə aldığı krediti ödəyəcəyinə vəd verən tərəfdir.

Kredit müxtəlif formalarda reallaşdırıla bilər. Lakin, baza forması olaraq kredit pul, mal-əmtəə və qarışıq formalarda təzahür edir.

Suda kapitalının və yaxud da borca verilmiş pul vəsaitlərinin hərəkəti kredit formasında təcəssüm olunur. Daha dəqiq desək, kredit dedikdə, borcalanla borcverən arasında müəyyən məbləğdə pul vəsaitlərinin müəyyən faiz müqabilində geri qaytarılmasını təmin edən müqavilə formasıdır.

Kreditin mahiyyəti bu anlayışın ifadə etdiyi hərfi məna ilə çox uyğundur. Belə ki, kredit latın dilindən tərcümədə etimad etmə, inanma mənalarını verir. Başqa sözlə desək, kredit inam əsasında pul

vəsaitinin bir nəfərdən çıxaraq digərinə hərəkət etməsi prosesidir. Lakin burada diqqət edilməsi lazım olan əsas nüans kreditin müəyyən faiz müqabilində və qaytarılmaq şərtilə verilməsidir. Kredit həm pul formasında, həm də hansısa əmtəənin ödəniş vasitəsi kimi çıxış edə bilər. İstənilən halda kredit satın alınmış məhsulun dəyərinin dərhal ödənməsini deyil, onun müəyyən müddət ərzində hissə-hissə ödənməsini təmin edir.

## Metod

İlk olaraq tədqiqat predmetinin nəzəri əsasları öyrənilmişdir. Bu mərhələdə kommersiya banklarının kredit əməliyyatlarının nəzəri-metodoloji məsələlərinin tədqiqinə yanaşmalar nəzəri baxımdan təhlil edilmişdir ki, bu da tədqiqatın məqsədlərinin həyata keçirilməsində açar rolunu oynayır. Burada sistemləşdirmə, qruplaşdırma, müqayisə etmə metodlarından istifadə edilmişdir.

Məqalənin yazılmasında analiz və sintez, eyni zamanda da induksiya və deduksiya, müqayilə təhlil, eksperiment, modelləşdirmə, sistemli yanaşma və qrafik metodlarından istifadə olunmuşdur. Belə ki, analiz metodu kimi mövzu tam şəkildə götürülmüş və daha sonra hissələrə bölünərək ayrı-ayrılıqda təhlil olunmuşdur. Daha sonra isə sintez metodu vasitəsilə bu hissələr iqtisadi sistemdə birləşdirilmişdir. İnduksiya metodu vasitəsilə məqalənin mövzusu haqqında iqtisadi faktlar toplanmış, sistemləşdirilmiş və araşdırılmışdır. Sonra isə deduksiya metodu vasitəsilə isə həmin toplanmış faktlar əsasında nəzəri nəticələr, ümumi prinsiplər, başqa sözlə desək, əməli fəaliyyət üçün lazım olan zəruri tövsiyyələr müəyyən edilmişdir.

Kreditin mahiyyəti bu anlayışın ifadə etdiyi hərfi məna ilə çox uyğundur. Belə ki, kredit latın dilindən tərcümədə etimad etmə, inanma mənalarını verir. Başqa sözlə desək, kredit inam əsasında pul vəsaitinin bir nəfərdən çıxaraq digərinə hərəkət etməsi prosesidir. Lakin burada diqqət edilməsi lazım olan əsas nüans kreditin müəyyən faiz müqabilində və qaytarılmaq şərtilə verilməsidir. Kredit həm pul formasında, həm də hansısa əmtəənin ödəniş vasitəsi kimi çıxış edə bilər. İstənilən halda kredit satın alınmış məhsulun dəyərinin dərhal ödənməsini deyil, onun müəyyən müddət ərzində hissə-hissə ödənməsini təmin edir (Cavadov A.M., 2012, s. 25).

Kredit əməliyyatlarının iki tərəfi - krediti verən və alan tərəfləri olur. Kredit verən ödəmə vədi alaraq pul vərən tərəf, kredit alan isə aldığı krediti ödəyəcəyinə vəd verən tərəfdir (Bağırov M.M., 2014, s. 107).

Kredit müxtəlif formalarda reallaşdırıla bilər. Lakin, baza forması olaraq kredit pul, mal-əmtəə və qarışıq formalarda təzahür edir. Qeyd olunanlarla yanaşı kredit kredit alanın kimliyindən asılı olaraq aşağıdakı sxemdə verilmiş formalarda da təzahür edə bilər.

Ssuda kapitalının və yaxud da borca verilmiş pul vəsaitlərinin hərəkəti kredit formasında təcəssüm olunur. Daha dəqiq desək, kredit dedikdə, borcalanla borcverən arasında müəyyən məbləğdə pul vəsaitlərinin müəyyən faiz müqabilində geri qaytarılmasını təmin edən müqavilə formasıdır.

Kreditin mahiyyətinin izah olunması onun əsas vəzifələrini, funksiya və prinsiplərini araşdırmadan mümkün deyildir. İqtisadi kateqoriya kimi kredit pul vəsaitlərinin hərəkətini təmin etdiyindən, mühim iqtisadi məqsəd və vəzifələri də özündə əks etdirir. Kreditin mahiyyəti onun həyata keçirdiyi vəzifələrlə dərindən təhlil oluna bilər.

Əhalinin ayrı-ayrı təbəqələrinin, eləcə də sahibkarların kreditlə təmin olunması onların ehtiyaclarını qarşılamaqla bərabər eyni zamanda da iqtisadi inkişafın sürətlənməsinə şərait yaradır (Панова Г.С., 2018, c. 107). Belə ki, əhalinin zəruri istehlak məhsulları ilə təmin olunması məqsədilə aldıqları kreditlər digər sahibkarları da stimullaşdırır. Məsələn, əhalinin hər hansısa bir təbəqəsinin mebel avadanlıqlarına zəruri tələbatı var, lakin həmin məhsulu almaq üçün tələb olunan pul vəsaitlərinə sahib deyil. Belə olan halda həmin şəxs ona lazım olan əmtəəni almaq üçün banka müraciət edərək kredit götürür. Bank isə öz növbəsində həmin krediti ya pul formasında, ya da əmtəə formasında təqdim edir. Hər iki halda əhali kreditləşir və ona lazım olan əmtəəni realizə edir. Nəticədə mebel istehsalçısının istehsal etdiyi məhsul asanlıqla realizə olunur və sahibkar mənfəət əldə edir. Sahibkar əldə etdiyi mənfəətlə öz fəaliyyətini inkişaf etdirə və onu şaxələndirə bilər. Belə olan hallarda isə istehsalın yeni formalarının yaranması üçün də real şərait formalaşmış olur. Deməli onda əhalinin ayrı-ayrı təbəqələrinin kreditləşməsi son nəticədə iqtisadi inkişafa öz müsbət təsirini vermiş olur.

Kreditin əsas formalarından biri sayılan kommersiya kreditləri iqtisadi inkişafa sürətli təsir göstərmək potensialına malikdir. Belə ki, kommersiya kreditlərinin həyata keçirilməsində başlıca məqsəd əmtəələrin asanlıqla realizə olunma sürətini artırmaqdır. Sahibkarlar arasında həyata keçirilən kommersiya krediti veksel şəklində bağlanmaqla əmtəənin asanlıqla satışını təmin etmiş olur (Гринспэн A., 2014, c. 109).

Kredit əməliyyatlarının həyata keçirilməsi iqtisadi münasibətlərin formalaşmasını da zəruri edir. Belə ki. kredit borcalan və borcverən arasında münasibətləri tənzimləməklə, pul kapitalının borc kapitalına çevrilməsini sürətləndirir. Belə olan halda isə borcalan götürdüyü kreditdən elə istifadə etməlidir ki, həmin borc kapitalı ona daha çox mənfəət qazandırsın. Çünki qazanılmış mənfəətin borcalanla kreditor arasında bölüşdürülür. Başqa sözlə desək, borcalan kreditə götürdüyü vəsaitdən elə istifadə etməlidir ki, əldə etdiyi mənfəətlə götürdüyü kreditlə üzrə faizləri də ödəyə bilsin və öz şəxsi mənfəətini da formalaşdırmaq iqtidarında olsun.

Kreditlərin əsaslandırılmış sərhədlərinin müəyyən olunması və bu sərhədlərə riayət olunması həm bütövlükdə iqtisadiyyat üçün, həmçinin də kredit əlaqələrinin iştirakçıları üçün mühim əhəmiyyət kəsb edir. Kreditlərin sərhədlərinin müəyyən olunması dedikdə, lazım olan həcmdə kreditlərin ayrılması prosesi başa düşülür. Başqa sözlə desək, tələb olunan həcmdə kreditlərin verilməsi iqtisadi inkişafa müsbət təsir göstərə bilər. Bir çox hallarda isə kredit sərhədlərinin düz müəyyən olunmaması son nəticədə artıq həcmdə kreditin verilməsi ilə nəticələnir ki, bu da əlavə xərclərin yaranmasına səbəb olur. Əlavə yaranmış xərclər isə istehsal proseslərinin səmərəliliyinin qarşısını alır. Məhz bu səbəbdən də kredit sərhədlərinin düzgün müəyyən olunması son nəticədə iqtisadi inkişafa özünün müsbət təsirini bəxş etmiş olur.

Kredit sərhədlərinin düzgün müəyyənləşdirilməsi hər şeydən əvvəl onu geri almaq prosesinin sadələşdirilməsi baxımından da mühim əhəmiyyət kəsb edir. Belə ki, tələb olunan həcmdən az miqdarda kreditin ayrılması borcalanın sürətli inkişafına əngəl yarada bilər və son nəticədə kreditin ödənilməsində müəyyən problemlər yarana bilər. Eyni zamanda da tələb olunan həcmdən artıq vəsaitin kredit şəklində verilməsi borcalanın faizlə əlavə yüklənməsinə səbəb ola bilər ki, bu da son nəticədə alınmış kreditlərin geri ödənişlərində müəyyən qədər problemlər yarada bilər. Odur ki, kredit sərhədlərinin düzgün müəyyən olunması verilmiş kreditlərin borcalan tərəfindən vaxtında ödənməsini də təmin etmiş olur (Панова Г.С., c. 211).

Yüksək kapital ehtiyatlarına malik ölkələrdə istehsal prosesinin kapitallaşdırılması və sürətləndirilməsi beynəlxalq kreditin əsas müsbət rolu kimi çıxış edir. Bu yolla istehsalın fasiləsizliyi təmin edilmiş olur. Eyni zamanda beynəlxalq kredit istehsal prosesinin halqaları arasında sıx əlaqə yaradır. Beynəlxalq kredit istehsalın beynəlmiləlləşməsi, mübadilə prosesinin genişlənməsi, əməyin beynəlxalq bölgüsünün həyata keçirilməsi və bununla da vahid dünya bazarının formalaşmasında mühüm rola malikdir. Digər tərəfdən, beynəlxalq kredit vəsaitləri hökumətin üzərinə düşən funksiyaların icrası zamanı meydana çıxan maliyyə boşluqlarını aradan qaldırır. Bura dövlət büdcəsinin ehtiyaclarının ödənməsi məqsədi ilə cəlb edilən xarici kreditlər aiddir. Bu kreditlərə aşağı inkişaf səviyyəsinə malik ölkələrdə daha çox ehtiyac yaranır. Həmçinin beynəlxalq kredit tədiyyə balansında əmələ gələn kəsirin aradan qaldırılmasına xidmət edir. Bu dövlətin pul-kredit siyasətinə xidmət etməklə yanaşı beynəlxalq ticarətin normal inkişafına şərait ya radır. Beynəlxalq kredit münasibətləri məhsulların dünya bazarında reallaşmasını sürətləndirir. Belə ki, müasir şəraitdə idxalixrac əməliyyatlarının böyük hissəsi kredit münasibətləri əsasında həyata keçirilir. Beynəlxalq kreditin müsbət cəhətləri ilə yanaşı mənfi təsirləri də mövcuddur. Bu baxımdan onun iqtisadiyyatda dərin disporsiyalara gətirib çıxarmasını göstərmək olar. Belə ki, ölkə iqtisadiyyatının daha güclü, yəni, yüksək imkanlara, gəlirə malik sahələri beynəlxalq kredit vasitəsilə gücləndiyi halda, digər sahələr inkişafdan geri qalmış olur. Məs., bu gün daha çox ölkəmizin neft sektoru kreditləşdirilir. Buna əsas səbəb isə daha çox gəlir, risklərin az, dünya bazarında neft məhsullarına daha çox tələbin olmasıdır. Həmçinin iqtisadiyyatın zəif sahələrinin beynəlxalq kredit bazarına çıxışı mümkünsüzdür. Bu halların qarşısını almaq üçün beynəlxalq kredit sərhədlərinin gözlənilməsi çox vacibdir. Beynəlxalq kredit sərhədləri ölkənin xarici borc vəsaitinə olan borcun həcmindən, kreditin müddətindən, faiz dərəcələrindən və s.

asılıdır. Bu obyektiv sərhədin pozulması ölkədə dərin xarici borc böhranına yol açmış olur (Чечеткина Т., 2012, с. 91).

İnkişaf etmiş ölkələrin təcrübəsinə əsasən deyə bilərik ki, bele ölkələrdə əhaliyə verilən kreditlər içərisində ən yüksək payı istehlak və ipoteka kreditləri təşkil edir. Qeyd olunan iki kredit növündən isə istehlak kreditləri daha səmərəli kredit növü hesab olunur. İstehlak kreditləri vasitəsilə banklar daha asanlıqla gəlir əldə edirlər. Çünki bu növ kreditlərin həcmi kiçik olduğundan həmin kreditlərin geri ödənilmə prosesində də çətinliklər yaşanmır və bank daha asanlıqla mənfəət əldə etmiş olur. Bu səbəbdən də bankların əksəriyyəti istehlak kreditlərini verməkdə maraqlıdırlar.

Əhalinin kreditləşməsi prosesi özü ilə mənfəət gətirdiyi qədər də risk də gətirir. Əhalinin kreditləşməsi prosesində yaranan hər bir risk müxtəlif təsirlər əsasında yaranır. Həmin təsirlərə aşağıdakıları misal çəkə bilər:

1.Gözlənilmədən baş verə biləcək təbii fəlakətlər. Məsələn, sahibkar öz biznesini inkişaf etdirmək baxımından biznes krediti götürmüş, lakin onun biznesinin yerləşdiyi ərazidə zəlzələ, daşqın və digər bu kimi təbii fəlakətlər baş vermiş və bunun nəticəsində sahibkar bütün əmlakını itirmişdir. Belə olan halda həmin sahibkara verilmiş kredit də risk altındadır;

2.Borcalan müəssisənin istehsal etdiyi məhsula tələbatın azalması. Belə olan halda həmin müəssisə istehsal etdiyi məhsulu tam həcmdə realizə edə bilməyəcək və nəticədə rentabellilik çox aşağı düşərək alınmış kreditin ödənilməsində ciddi problemlər yaradacaqdır;

3.Borcalan müəssisənin müəyyən müddətdən sonra bazarda rəqabət mübarizəsindən kənarda qalması;

4.İqtisadi proseslərin borcalan müəssisənin fəaliyyətinə neqativ təsirləri;

5.Borcalan müəssisələrin maliyyə siyasətində baş vermiş səhvlər.

Qeyd olunan bu amillər kreditləri risk altına alan əsas amillər hesab olunur. Bu səbəbdən də sahibkarlara təqdim olunan kreditlər, eləcə də bu kreditlərin sərhədləri əhatəli şəkildə araşdırılmalı, baş verə biləcək bütün risklər təhlil olunmalı, biznes subyektinin yerləşdiyi coğrafi ərazinin seysmoloji vəziyyəti təhlil olunmalı, eləcə də müəssisənin son 10 il ərzində maliyyə vəziyyəti araşdırılmalı, vergi ödəyicisi kimi ödədiyi vergilərin həcmi təhlil olunmalıdır.

Kommersiya kreditinin ən mühim xüsusiyyəti onunla ifadə olunur ki, bu kredit forması satışın sürətləndirilməsini təmin etməklə istehsal olunmuş məhsulun istehsalçıdan istehlakçıya asan keçidinə şərait yaradır. Burada mal satıcısının əsas məqsədi istehsal etdiyi və ya aldığı məhsulu daha tez müddətə reallaşdırması, alıcı subyektin əsas məqsədi isə tələb olunan məhsulu ilkin ödəniş etmədən əldə etməsidir. Şübhəsiz ki, təsərrüfat krediti ilə alınmış məhsulun dəyəri nağdsız və müddətli formada ödəniləcəyi üçün möhlət haqqı da məhsulun qiymətinə əlavə olunur və bu məbləğ bank faizləri ilə müqayisədə kifayət qədər azdır.

Kommersiya krediti ödənmə formasına görə də üç əsas növə bölünür (Məmmədov Z.F., 2017, s. 107):

- Tarixi təsbit edilmiş
- Konsiqnasiya (hissə-hissə ödəmək)
- Açıq hesabla kreditləşmə

Tarixi təsbit edilmiş qaydada ödənişdə alıcı müəssisə aldığı məhsulun tam dəyərini hansı tarixdə ödəcəyinə dair sadə veksel təqdim edir və ya satıcı müəssisə satdığı məhsulun tam dəyərinin hansı tarixdə ödənilməsinə dair alıcı müəssisəyə tratta təqdim edir. Başqa sözlə desək, tərəflərin razılığı əsasında məhsulun tam dəyərinin konkret bir tarixdə ödənilməsini nəzərdə tutan müqavilə formasından istifadə olunur.

Konsiqnasiya qaydasında isə satıcı müəssisə satmış olduğu məhsulun dəyərini müxtəlif hissələrə bərabər bölərək alıcı müəssisədən ödənməsini tələb edir. Belə olduğu halda isə hər bir ödəmə tarixində alıcı müəssisə ödəmə öhdəliyini sübut edən veksel təqdim etməlidir.

## Nəticə

Kreditlərin əsaslandırılmış sərhədlərinin müəyyən olunması və bu sərhədlərə riayət olunması həm bütövlükdə iqtisadiyyat üçün, həmçinin də kredit əlaqələrinin iştirakçıları üçün mühim əhəmiyyət kəsb edir. Kreditlərin sərhədlərinin müəyyən olunması dedikdə, lazım olan həcmdə kreditlərin ayrılması

prosesi başa düşülür. Başqa sözlə desək, tələb olunan həcmdə kreditlərin verilməsi iqtisadi inkişafa müsbət təsir göstərə bilər. Bir çox hallarda isə kredit sərhədlərinin düz müəyyən olunmaması son nəticədə artıq həcmdə kreditin verilməsi ilə nəticələnir ki, bu da əlavə xərclərin yaranmasına səbəb olur. Əlavə yaranmış xərclər isə istehsal proseslərinin səmərəliliyinin qarşısını alır. Məhz bu səbəbdən də kredit sərhədlərinin düzgün müəyyən olunması son nəticədə iqtisadi inkişafa özünün müsbət təsirini bəxş etmiş olur.

**Ədəbiyyat**

1. Abbasov Ə., Həmişəyeva Ş., Məmmədov Z., Rzayev R. Bank işi ilə elektron bankçılıq. Bakı - 2003. 440 s.
2. Abdullayev Ş.Ə., Əsgərova R.V. “Bank işi” Dərslik. 2017, 512 s.
3. Bağırov M.M. “Banklar və bank əməliyyatları” Dərslik. 2014, 470 s.
4. Bəşirov R.A. “Bank işi” Dərslik. 2017, 340 s.
5. Cavadov A.M., Kommersiya bankları məhsul və xidmətlərinə qiymət-qoyma. Bakı 2012, 542 s.
6. Əliyev M.F. Bankların inkişaf istiqamətləri. Monoqrafiya. Bakı, “Şərq-Qərb” Nəşriyyat evi, 2014, 120 səh.
7. Əliyev M.F., Bank məhsullarının inkişaf strategiyası. 2016, 378 s.
8. Əliyev M.F., Bank məhsullarının inkişaf strategiyası. İqtisadiyyat və audit jurnalı, 2013-cü il, №8., 104 s.
9. Əliyev M.F., Bank islahatları ilə vahid reytinq sistemi ilə qiymətləndirmə. Ekspert jurnalı, 2016-ci il, №3-4., 114 s.
10. Məmmədov Z.F. Bank fəaliyyətinin əsasları. (Elmi-nəzəri və praktki məlumat kitabı). Bakı, Azərnəşr. 2017. səh. 480.
11. Panova GS, Credit policy of commercial banks. M. 2018, 412 c.
12. Trechtenberg IA, Credit money system of capitalism after the Second World War. M. 2016, 756 c.
13. Chechetkina T. Small commercial banks: problems, perspectives / T.Chechetkina, V.Petushkov //Economist. -2012. -N 8. -C. 89-93.
14. Shalamov GA "Small" problems of the provincial bank in the mirror of the big economy // Society and economics. -2014. - N 9-10. - C. 100- 105.
15. Shvetsov Yu.G. Capital of the bank: its availability and function / Yu.G.Shvetsov, VGKoreshkov // Money and credit. - 2014. - N 6. - C. 34-36.

**Rəyçi: iqtisad e.d. E.Sadıqov**

Göndərilib: 19.02.2022 Qəbul edilib: 18.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/59-63

**İlkin Maqsud oğlu İmanlı**
Azərbaycan Turizm və Menecment Universiteti
magistrant
ilkinimanoff@gmail.com

# MÜASİR ŞƏRAİTDƏ MALİYYƏ RİSKLƏRİNİN İDARƏ EDİLMƏSİ

**Xülasə**

Məqalədə göstərilir ki, liberal iqtisadiyyatlarda sərbəst bazar şərtləri nə dərəcədə inkişaf edirsə, bazar da, bir o qədər sabitləşir. Lakin sərbəst bazar şərtləri tam formalaşmadığı üçün bu prosedur müşahidə olunmur. Dalğalanmalar, struktur xüsusiyyətlərindən və ya xüsusi şərtlərdən irəli gələn səbəblərə görə müşahidə olunur. Bu dalğalanmalar iqtisadi qərar qəbul edənlərin proqnozlarının reallaşma ehtimalını azaldır. Müəssisəyə xas olan risk, ticarətin mövcudluğundan bu yana hər zaman qaçınılmış, lakin mənfəət və ya qazanc üçün müxtəlif səviyyələrdə tətbiq olunan bir element kimi realizə olunmuşdur. İnkişaf etməkdə və dəyişməkdə olan ticarət əlaqələrində risk də müxtəlif ölçülərdə özünü göstərmişdir.

***Açar sözlər:*** *maliyyə, risk, idarəetmə, müasir dövr*

**Ilkin Maqsud Imanli**

## Financial risk management in modern conditions

**Abstract**

In the article showed that, communication has been improved and accelerated by the use of computers in communication. This development led to the name of the information age. Depending on the speed of communication, the speed of dissemination and use of knowledge also increases. The use of knowledge has become important as a feature that needs to be emphasized more than being informed (learning). To this end, in modern times, changes in the country's economy are studied more quickly in other countries, and this information is acted upon in the light. Therefore, changes in the economy of one country affect the economy of other countries. In our globalized world. economies are becoming more open to external influences. As a result of these effects, there are changes in prices, interest rates and exchange rates. The risky environment created by the fluctuations has become a phenomenon for markets.

***Key words:*** *finance, risk, management, modern times*

Ümumiyyətlə, risk obyektiv olaraq müəyyən edilə bilən zərər ehtimalı kimi təyin edilir. Nəzəri olaraq, risk gözlənilən dəyərlə həqiqi dəyər arasındakı həm müsbət, həm də mənfi yöndə əyilmələri əhatə etsə də, tez-tez risk anlayışı mənfi (əlverişsiz) əyilmə kimi qəbul edilir. Gündəlik həyatın demək olar ki, hər sahəsində istifadə olunan risk anlayışı mövzu baxımından gözlənilən dəyərlə həqiqi dəyər arasındakı fərq kimi qiymətləndirilir.

Maliyyə risklərinin idarə edilməsi, risk nəzarəti daxil olmaqla bir anlayış olaraq, riyazi baxımdan davamlı olan funksiyanın xüsusiyyətini göstərir. Başqa sözlə, maliyyə risklərinin idarə edilməsi, bir çox maliyyə göstəricilərinin müəssisələrin xüsusi vəziyyətləri ilə əlaqələndirilməsi nəticəsində bu yöndə, verilmiş qərarların daim nəzərdən keçirildiyi və lazım olduqda yeni tədbirlərin götürüldüyü dinamik bir prosesdir (Abbasov S.A: 2009. s. 47.). Maliyyə riskinin idarə olunmasında gündəlik, qısa və uzunmüddətli qərarlar qəbul edilir. Mövcud hüquq və öhdəliklərin nəzərdən keçirilməsinin zərurəti zaman anlayışının vacibliyini ortaya qoyur. Maliyyə qərarlarının müvəffəqiyyəti düzgün qərarlardır. Bu qərarların vaxtında verilməsi və həyata keçirilməsi ilə sıx bağlıdır. Bu yöndə doğru zamanlama maliyyə menecmentinin ən vacib cəhətlərindən biridir.

Kompüterlərin ünsiyyətdə istifadəsi ilə rabitə yaxşılaşdırılmış və sürətlənmişdir. Bu inkişaf dövrün informasiya əsri adlandırılmasına səbəb oldu. Ünsiyyət sürətindən asılı olaraq, biliklərin yayılması və istifadəsindəki sürət də artır. Biliyin istifadəsi məlumatlı olmaqdan (öyrənməkdən) daha çox vurğulanması lazım olan bir xüsusiyyət olaraq əhəmiyyət qazandı. Bunun üçün müasir dövrdə, ölkə iqtisadiyyatında mövcud olan dəyişiklik digər ölkələrdə daha tez öyrənilir və bu məlumatlar işığında hərəkət edilir. Bu səbəbdən bir ölkənin iqtisadiyyatındakı dəyişiklik digər ölkələrin iqtisadiyyatına da təsir edir. Qloballaşan dünyamızda iqtisadiyyatlar xarici təsirlərə daha açıq olur. Bu təsirlərdən dolayı qiymətlərdə, faiz dərəcələrində və məzənnələrdə də dəyişikliklər var. Dalğalanmaların yaratdığı riskli mühit bazarlar üçün bir fenomen halına gəldi. İqtisadiyyatlardakı gözlənilməz dəyişiklik bazarları daha riskli etdi və risk idarəetmə metodlarının hazırlanması ilə tətbiqində tələb meydana gəldi.Texnikaların inkişafı və tətbiqi üçün istifadəçilərdən tələb olmalıdır. Bu yöndə də, tələbin mövcud olması üçün onu yaradan şərtlər formalaşdırılmalıdır. "Maliyyə riski idarəetmə üsullarının şaxələndirilməsi və geniş yayılması da bugünkü maliyyə şərtlərinin daha riskli hala gəldiyini iddia edən bir dəlil olaraq irəli sürülə bilər". Maliyyə risklərinin idarə edilməsi üsullarına tələbi müəyyən edən əsas dəyişən maliyyə riskidir. Bu səbəbdən müasir dövrdə, maliyyə riskləri gün keçdikcə artır.

İnkişaf etməkdə olan və dəyişən ticarət əlaqələrinin yaratdığı yeni risk növləri, yeni qaçınma üsullarının inkişaf etdirilməsini zəruri etmişdir. Hal-hazırda istifadə olunan bir çox risk idarəetmə üsulu var. Texnikalar da öz-özlüyündə çox fərqlidir. Bununla yanaşı, digər texnikalarla sintez edilərək qarışıq metodlar şəklində də tətbiq olunur. Bu inkişaf etmiş texnikaların inkişaf etdirilməsində məqsəd riskdən qaçmaq olsa da, bu məqsədlə mənfəət əldə etmək məqsədi ilə də tətbiq olunur (Allahverdiyeva M: 2010. s. 43).

"Müasir risk idarəetmə üsulları əvvəlcə maliyyə institutları tərəfindən faiz dərəcələrində gözlənilməz enmələrin təsirlərini aradan qaldırmaq üçün istifadə olunur ki, bu da faiz gəlirlərini azaldır (faiz xərclərini artırır)." Risk idarəetməsi daha sonra inkişaf etdirildi. Burada əlaxsus faktor valyuta məzənnəsi riskləri və əmtəə qiymətlərindəki dəyişikliklərdən yaranan risklər də daxil olmaqla, qeyri-kommersiya qurumları tərəfindən tətbiqidir. Bu baxımdan risklərin idarə edilməsi üsulları geniş bir tətbiq sahəsinə malikdir. Valyuta məzənnələri, faiz dərəcələri və qiymətlərdəki dalğalanmalar yalnız mənfəət yönümlü təşkilatlar üçün deyil, eyni zamanda, dövlət qurumları və qeyri-kommersiya təşkilatları üçün də əhəmiyyətli bir faktor ola bilər. Müəssisələrin fəaliyyət sahələrindəki fərqlər, ölkələrin və sektorların ənənələrindəki fərqlər, müəssisələrin mövqelərindən irəli gələn xüsusi fərqlər müxtəlif maliyyə ehtiyaclarını yaratdı və yaratmağa da, davam edir. Meydana gələn bu, yeni tələblərə cavab vermək üçün yeni risk idarəetmə üsulları inkişaf etdirir (H. Həsənov: 2013. s. 36.).

Ənənəvi Risk İdarəetmə Texnikaları müasir risk idarəetmə üsulları inkişaf etdirilmədən əvvəl hökumətlərin siyasətindən asılı olaraq həyata keçirilən əhəmiyyətli miqdarda təminat, ixracat və idxalın şaxələndirilməsi, ixracat sığortası kimi kifayət qədər çevik olmayan və daha yüksək xərclərə sahib olan bu metodlar müasir risk idarəetmə üsulları ilə əvəz edilmişdir.

Ənənəvi metodlardan daha sərfəli olan müasir risk idarəetmə üsulları daha az xərcli və daha çevik istifadə imkanları ilə risklərin idarəedilməsində əhəmiyyətli inkişaflara gətirib çıxardılar.

Risk idarəetmə üsulları, maliyyə praktiklərinə əhəmiyyətli üstünlüklər verməklə yanaşı, bazarda ticarət edənlərin hər hansı iqtisadi göstərici ilə bağlı proqnozlarının əvvəlcədən açıq şəkildə izah edilməsini təmin etməklə gələcək üçün gözləntilərin müəyyən dərəcədə həddən artıq əyilmə göstərməsinin qarşısını alır, beləliklə də, bazarlarda sabitləşdirici rol oynayırlar (Kazımlı.X., Quliyev. İ: 2011. s. 56).

Müasir risk idarəetmə üsullarının tətbiqi gələcəyə dair gözləntiləri müəyyən dərəcədə özündə cəmləşdirdiyindən və gözləntilərin reallaşmasını planlaşdırma imkanı təmin etdiyindən maliyyə menecerləri, faizlər, valyuta məzənnələri, qiymətləri, ən azından onları maraqlandıran hüquq və vəzifələr baxımından bunları təyin etməyə imkan verir. Beləliklə, gələcəkdə maliyyə daxilolmaları və xaricolmalarının miqdarı müəyyən edilə bilər. Bu baxımdan, risk idarəetmə üsulları planlaşdırma və büdcəyə əhəmiyyətli töhfələr verir. Bundan əlavə, maliyyə riski idarəetmə üsullarının çevik üstünlükləri, əməliyyat büdcələrini rahatlıq və davamlılıq prinsipinə uyğun hazırlamağa kömək edir (Бригхем Ю., Хьюстон Дж: 2007. s. 128).

İnkişaf etmiş teknika inkişafda olan texnologiyaya paralel olaraq, risk idarəetmə qərarlarını dəstəkləmək üçün istehsal olunan və maliyyə tətbiqetmələrinə təqdim edilən kompüterlərin paket proqramları ilə qərar qəbul etmə proseslərini sürətləndirməklə yanaşı, onun effektivliyinidə artırdı. Bazarların beynəlxalq xarakter qazanması belə yanaşmanı zəruri etdi. Maliyyə menecerləri əvvəlkindən daha çox məlumatı daha sürətli və daha ucuz əldə etmək imkanına malikdirlər. Bu rabitə proseslərində kompüterlərin intensiv istifadəsi nəticəsində məlumatlar; sistematik, dəqiq, sürətli, ucuz, toplana bilən və istifadə edilə bilən olmuşdur. Əslində bu proseslərdə təsirli qərarlar qəbul edə bilmək üçün "Qiymətləndirmə və alqı-satqı proseslərinin inkişaf etmiş bir kompüter tərəfindən dəstəklənmədiyi təqdirdə yeni maliyyə riski idarəetmə üsullarını müvəffəqiyyətlə tətbiq etməyin mümkün olmadığı proqramlar qəbul edilə bilər" ( Галанов В.А: 2012. s. 87-89).

Riskin idarə olunması davamlı və mürəkkəb əməliyyatları əhatə etdiyi üçün risk idarəetmə prosesini aydın şəkildə göstərmək asan deyil. Bununla birlikdə, uğurlu risk idarəsi haqqında danışmaq üçün aşağıdakı mərhələləri əhatə etməsi barədə geniş fikir mövcuddur:

I Mərhələ: Riskin nədən qaynaqlandığını açıq şəkildə göstərmək,

II Mərhələ: Riskin müəyyənləşdirilməsi (ölçülməsi),

III Mərhələ: Riskin müəssisənin maliyyə məqsədlərinə çatmasına təsirlərinin müəyyənləşdirilməsi,

IV Mərhələ: Müəyyən olunmuş riskin dözülən olub-olmamasına qərar vermək,

V Mərhələ: Riskin qarşısını almaq üçün texnikanın seçilməsi və vaxtında tətbiqi.

**Riskin nədən qaynaqlandığını açıq şəkildə göstərmək.** Bu mərhələdə riskin nə olduğunu və haradan qaynaqlandığını yaxşı başa düşmək lazımdır. Təcrübədə bu məqsəd üçün istifadə olunan ən sadə və anlaşılan metod qrafiklərin köməyi ilə riskin üzə çıxarılmasıdır.

Risklərin müəyyənləşdirilməsi mərhələsində aşağıdakı prinsiplərə əməl edilməlidir:

a. Riskin mənşəli olduğu makroiqtisadi amillərin aşkarlanması: Riskin məzənnə riski, faiz dərəcəsi riski və ya qiymət dəyişikliyindən irəli gələn risk olduğu aydınlaşdırılmalıdır. Bir məzənnə riski varsa, bu riskin əməliyyat riski, mübadilə riski və ya iqtisadi risklərə məruz qalması ilə əmələ gələn analitik risklər olaraq müəyyən edilməlidir.

b. Risk xüsusi bir vəziyyətdən və ya struktur səbəblərdən qaynaqlana bilər. Risk konkret bir səbəbdən qaynaqlanırsa, tədbir almaq adətən asandır. Müəssisənin yalnız müəyyən bir risklə qarşılaşdığını düşünmək doğru deyil. Müəssisələr ömrünün hər anında fərqli risklərlə qarşılaşırlar. Burada xatırlanmaq üçün nəzərdə tutulan, müəssisənin mövcud risklərinə əlavə olaraq inkişaf edən xüsusi vəziyyətdir. Əks təqdirdə, maliyyə risklərinin cəmi həmişə işləyən müəssisələrdə həmişə mövcud olacaqdır.

**Riskin müəyyənləşdirilməsi (ölçülməsi).** Bu mərhələdə müəssisənin müvəffəqiyyəti və riskin həssaslığı üzə çıxır. Burada, riskin müəssisənin müvəffəqiyyətinə təsirləri görünməyə çalışılır. Bu məqsədlə həssaslıq analizi və simulyasiya kimi tətbiqetmələrdən istifadə olunur. Lakin bu təyinatlar fərziyyələrə əsaslandığından fərziyyələr çox diqqətlə və obyektiv meyarlara əsasən dirilməlidir (Abbasov S.A: 2009. s. 66).

**Riskin müəssisənin maliyyə məqsədlərinə çatmasına təsirlərinin müəyyənləşdirilməsi.** Bu mərhələdə maliyyə meneceri riski niyə idarə etdiyini qəti şəkildə başa düşməlidir. Bunun üçün maliyyə meneceri özünə bu sualı verməlidir: Risk menecmenti şirkətə və ya tərəfdaşlarına (səhmdarlarına) nə dərəcədə və necə fayda gətirəcək? Daha geniş bir perspektivlə, maliyyə meneceri təhlili, şirkət işçiləri, şirkət direktorları, dövlət və digər maraqlı tərəflər də daxil edilə bilər. Risk menecmentinin əsas məqsədi riskin qarşısını almaqdır. Bununla birlikdə, risk idarəetmə üsulları mənfəət üçün də istifadə edilə bilər.

Tətbiq ediləcək risk idarəetmə üsulu, müəssisənin qısa, orta və uzunmüddətli hədəfləri və hədəflənən maliyyələşmə quruluşu, seçiləcək risk idarəetmə texnikası üçün uyğundur. Əgər bu prosedur tətbiq olunursa, digər tətbiq olunan texnika ilə əlaqəli qurulmalı və onunla birlikdə tətbiq edilməsinin nəticələri açıqlanmalıdır. Müasir maliyyə risklərinin idarə edilməsi yanaşması, yalnız maliyyə riskinin idarə olunması üsulundan istifadə etməklə bütün maliyyə risklərinə qarşı kifayət qədər qorunmanın təmin edilə bilməyəcəyini qəbul edir. Bunun üçün bir-birinin risklərini azaldacaq və ya qarşısını alacaq, yaxud, çatışmazlıqlarını aradan qaldıracaq şəkildə bir neçə fərqli maliyyə riski idarəetmə metodunun birlikdə tətbiq edilməsinə yaxınlaşma geniş qəbul edilir.

Hər şeydən əvvəl, maliyyə riskinin idarə olunması texnikası riskin qarşısını almaq, və ya mənfəət əldə etmək üçün tətbiq olunacağına qərar verilməlidir. Bunu edərkən klassik risk idarəetmə üsullarının və ya törəmə əsaslı üsulların seçiləcəyi müəyyənləşdirilməlidir. Bu qərarlar qəbul edilərkən, texnikanın hüdudları və xüsusiyyətləri müəyyən edilməlidir. Bu gün tətbiq olunan maliyyə risklərinin idarə edilməsi üsulları yerli və beynəlxalq bazarların fəaliyyətində mühüm rol oynayır. Bu üsullar "yaradıcı" konsepsiyasının nəticəsidir. "Çox güclü inkişaf potensialına sahib olan bu texnikaların yeganə həddi təxəyyüldən istifadə etmək bacarığıdır". Bu prosesdə sübutlar olsa da, şirkətlərin və ya bazarların xüsusi vəziyyətlərindən irəli gələn qalıcı və ya dövri məhdudiyyətlər var. Ümumiyyətlə, çox geniş istifadə sahəsi olan bir metodun şirkət üçün çox məhdud istifadəsi ola bilər.

**Müəyyən olunmuş riskin dözülən olub-olmamasına qərar vermək.** Müəssisədəki risk idarəetmə texnikası ilə əlaqəli imkanları irəli sürmək düzgün qərarlar qəbul etmək baxımından əhəmiyyətli faydalar təmin edilir. Bəzən bu mərhələdə bir bank və ya digər maliyyə vasitəçisi kimi risklərin idarə edilməsi tələblərinə uyğun texnika seçmək və təşkil etmək vəzifəsini öz üzərinə götürə bilər.

Seçilmiş hesab olunan risk idarəetmə metodlarının təsirləri işin riskini artırıb artırmayacağını və artırma ehtimalı varsa, mənfi inkişafları qarşılamaq üçün maliyyə imkanlarının olub olmadığını açıqlamaq lazımdır.

Maliyyə idarəsinin praqmatik təbiətinə görə seçilmiş texnikanın faydalı nəticələr verməsi və texnikanın tətbiqi xərclərindən çox olması prinsipi (xərc/mənfəət analizi) nəzərə alınmalıdır.

Maliyyə idarəciləri və ya işin maliyyə siyasətini icra edənlər bu iki meyl arasında risk sevən, riski bəyənməyən və ya riskə biganə bir meyl ola bilər. Bu meyllər, ehtimal olunan risk səviyyəsinin müəyyənləşdirilməsində də həlledici ola bilər. Bununla birlikdə, bütün bu meyllərə baxmayaraq, bugünkü şərtlərdə müasir risk idarəçiliyi haqqında danışa bilmək üçün, həyata keçirilə biləcək risk səviyyəsi ciddi meyarlara və hesablamalara əsaslanmalıdır. Buna görə maliyyə riski hesablanmış risk kimi müəyyən edilir və "obyektiv olaraq ölçülə bilən" xüsusiyyət vurğulanır.

**Riskin qarşısını almaq üçün texnikanın seçilməsi və vaxtında tətbiqi.** Bu mərhələ risk idarəetməsində son mərhələdir və ən çox diqqət tələb olunan mərhələdir. Bu mərhələdə maliyyə riski müəyyən edilmiş, ölçülmüş, bununla da, istiqaməti və meyli təyin edilmişdir. Riskin qarşısını almaq üçün uyğun ola biləcək risk idarəetmə metodlarının təsirləri müxtəlif aspektlərdən nümayiş etdirilmişdir. Ən uyğun texnikanı seçmək və vaxtında tətbiq etmək ən vacib addımdır. Qərar qəbul etməzdən əvvəl, xüsusən istifadə edilə bilən risk idarəetmə üsullarının müsbət və mənfi tərəfləri təqdim edilməli və müqayisə nəticəsində hansı texnikanın seçiləcəyinə qərar verilməlidir. Bu mərhələdə veriləcək qərarlar bəzən menecerlərin intuisiyasına və təcrübəsinə əsaslanır. Ancaq veriləcək qərarlar üzrlü səbəblərə əsaslanmalıdır (H. Həsənov: 2013. s. 75-77).

Maliyyə sferasının genişləndirilməsi, maliyyə risklərinin, ölkəmiz üçün ən yeni maliyyə texnologiyalarının yaradılması və digər əlamətlərə təsir səviyyəsi, yalnız hansısa təşkilatın fəaliyyətinin nəticələrinə deyil, ümumi şəkildə bazarın iqtisadi vəziyyətinə, konyukturasına təsir edir.

Xarici mühitin sahibkarlıq fəaliyyətinə münasibətində maliyyə riskləri qeyri-müəyyənliyinə görə obyektivlik daşıyır. Xarici amillərə obyektiv, sosial, iqtisadi və siyasi şəraitlər aiddir. Hansı ki, hər bir təşkilat özünün fəaliyyətini həyata keçirir, ümumi dinamikaya uyğunlaşmağa çalışır. Xarici amillərin qeyri-müəyyənliyi müəyyən edilir ki, o kontragent, dəyişən və şəxslərdən asılıdır. Hansının ki, davranışını əvvəlcədən düzgün şəkildə demək mümkün deyil. Beləliklə, maliyyə risklərinin obyektivliyi sonda müəssisənin fəaliyyətindən birbaşa asılı olmayan metodlar ilə bağlıdır.

Başqa prizmadan yanaşdıqda isə maliyyə risklərinin insan fəaliyyətindən asılı olan tərəflər vardır. Doğurdan da, sahibkar özü mövcud riskli vəziyyəti qiymətləndirir, bir neçə alternativ arasından öz seçimini edir və mümkün xərcləri müəyyənləşdirir. Əlavə olaraq riski qəbul etmə, hər bir sahibkarın məntiqindən, psixoloji xüsusiyyətlərindən, xarakterindən, bilik səviyyəsindən, öz fəaliyyət sahəsindəki təcrübələrindən də asılıdır.

Maliyyə riskləri həm mövcud fəaliyyət sahəsi üzrə resursların istifadəsi zamanı vəsaitlərin itirilməsi və ya gözlənilən mənfəətin olmaması təhlükəsidir, həm də risklə əlaqəli olan mövcud əldə olunan əlavə mənfəətdir.

Bazar münasibətləri şəraitində müəssisə və təşkilatlar risk etmədən mənfəət əldə edə bilmir. Riskə getmək, onları idarə etmək, risk hadisəsinin yaxınlaşmasını az da olsa proqnozlaşdırmaq, risk dərəcəsini aşağı salmağa şərait yaradan tədbirlər görmək demək olarki imkansızdır.

**Nəticə**

Qloballaşma fenomeni ilə, maliyyə riski idarəetmə üsullarının tətbiqi üçün səbəb olan "maliyyə riski" daha aydın hiss olunmağa başladı. Beynəlxalq ticarət əlaqələrində qurumların sayı və beynəlxalq ticarət əlaqələrinin intensivliyi artmışdır. Bu mühitdə maliyyə riskinin beynəlxalq ölçüsü əhəmiyyət qazandı. Beynəlxalq ticarət müqavilələrinin əksəriyyəti konvertasiya olunan güclü iqtisadiyyatlara əsaslanan valyutalar (ABŞ Dolları, Alman Markı, Yapon Yen, İngilis Sterlinqi və s.) beynəlxalq müqavilələrə tabe olan əsas valyutadır (elektron / valyuta, dominant valyuta). Beynəlxalq ticarət əlaqələrində olan ölkələr kimi inkişaf etməkdə olan ölkələrin qurumları, öz ölkələrinin pul vahidi xaricində bir valyutaya görə müqavilə bağlamaq vəziyyəti ilə qarşılaşdıqları üçün bu ölkələrdə xüsusilə məzənnə riski ön plana çıxır.

Maliyyə riskini təşkil edən faizlər, məzənnələr və qiymətlərdəki dəyişikliklər bir-birini təsir edir. Bu səbəbdən yalnız valyuta məzənnəsi maliyyə riskinin qarşısını alır. Faiz dərəcəsi və ya qiymət dəyişikliyindən yaranan risklərdən birinin qorunması kifayət deyil. Bu səbəbdən maliyyə risklərinin idarə edilməsi mürəkkəb və dinamik bir prosesdir.

Maliyyə risklərinin idarə edilməsi texniki nüanslara malikdir. Bu səbəbdən tətbiq ediləcək texnikalar obyektiv və elmi meyarlara görə geniş bir perspektivdən qiymətləndirilməli və sonra tətbiq edilməlidir. Əks təqdirdə, riskin qarşısını almaq məqsədi daşıyan bu əməliyyatlar riskin qarşısını ala bilmədi və işi daha çox risk altına sala bilər.

**Ədəbiyyat**

1. Abbasov S.A. Maliyyə menecmenti: təşkili və təkmilləşdirilməsi problemləri (monoqrafiya). Bakı, “Elm və Təhsil”, 2009. 288 səh.
2. Allahverdiyeva M. Beynəlxalq marketinq. Bakı, 2010. 444 səh.
3. Ambler T. Practical Marketing / T.Ambler. -St. Petersburg: Peter, 2000. 213c.
4. Atakişiyev M.C., Nurəliyeva R.N., Abbasova N.H. İnvestisiya fəaliyyətinin təşkili, Bakı, 2012. 251 səh.
5. Bağırov D.A., M.X. Həsənli “Maliyyə” dərslik. Bakı, 2011. 168 səh.
6. Brigham Yu., Houston J. Financial management. St. Petersburg: Piter, 2007. 544 p.
7. Cəfərli H.A. İqtisadi təhlil. Dərslik. Bakı, Elm və təhsil, 2009. 560 s.
8. Galanov V.A. (2012). Stocks and bods market. Textbook. Moscow: INFRA-M-378 s
9. Həsənov H. “Antiböhranlı idarəetmə”. Dərs vəsaiti. Bakı, 2013. 168 səh.
10. Həsənov H. “Müəssisənin iqtisaidyyatı”. Dərs vəsaiti. Bakı, 2013. 900 səh.
11. Xanhüseyn Kazımlı, İbrahim Quliyev. İqtisadi risklərin qiymətləndirilməsi və idarə edilməsi. Dərs vəsaiti. Bakı: “İqtisad Universiteti”, 2011. 187 səh.
12. Kazımov R.N., Namazova C.B. Praktiki audit. Dərslik. Bakı, CBS, 2012. 246 s.
13. Mahmudov I.M., Zeynalov T.Ş., İsmayılov N.M. İqtisadi təhlil. Dərslik. Bakı, İqtisad Universiteti. 2010. 796 s.
14. Müslümov S.Y., Kazımov R.N. Maliyyə təhlili. Dərslik. Bakı, CBS, 2011. 312s.
15. Namazova C.B. İnvestisiya qoyuluşlarının inkişaf perspektivləri.Monoqrafiya. Bakı. CBS, 2008, 222 s.

**Rəyçi: dos. S.Hacıyeva**

Göndərilib: 09.02.2022 Qəbul edilib: 12.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/64-68

**Pərvin Ədalət oğlu Nəsirzadə**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
nesirzade.pervin@gmail.com

# QAZIMA ƏMƏLİYYATLARI İLƏ ƏLAQƏDAR NEFT VƏ QAZ FƏLAKƏTLƏRİ VƏ SƏNAYE TƏHLÜKƏLƏRİ

**Xülasə**

Bu məqalə son 22 ildə dünya üzrə quruda və dənizdə neft və qaz qazma əməliyyatları ilə bağlı həyati təhlükəsi olan fəlakətlər və potensial təhlükələrə əsaslanan sistematik ədəbiyyat icmalına yönəlib. Bundan əlavə, tanınmış və orijinal məlumat bazalarından neft və qaz qazma əməliyyatları ilə bağlı olan iyirmi bir məqalə nəzərdən keçirilmişdir. Bununla bərabər, bu icmal sənədinin hazırlanmasında tematik təhlil və cədvəlli təqdimat yanaşmasından istifadə edilmişdir. Bu araşdırmanın ümumi nəticələrinə əsasən, insidentlərin və ölüm hallarının əksəriyyəti Yaxın Şərq və Cənub-Şərqi Asiya neft və qaz qazma sahələrində qeydə alınıb. Bundan əlavə, qazma avadanlığına texniki qulluq əməliyyatı hər iki qazma sahəsində sağlamlıq və təhlükəsizlik risk faktorları ilə sıx bağlıdır.

***Açar sözlər:*** *quyuların qazılması, sənaye təhlükəsizliyi, qazma əməliyyatı, risk faktorları, əməyin mühafizəsi*

**Parvin Adalat Nasirzade**

## Oil and gas disasters and industrial hazards related to drilling operations

**Abstract**

This article focuses on a comprehensive literature evaluation based on life-threatening events and possible risks linked with onshore and offshore oil and gas drilling operations in the previous 22 years throughout the world. In the first round of literature study focused on the oil and gas sectors, seventy-six relevant research publications were evaluated. In addition, twenty-one papers from reputable and reliable databases were selected that were especially connected to oil and gas drilling activities. This review article, on the other hand, was developed using a theme analysis and tabular representation technique. According to the general findings of this study article, the majority of events and deaths have occurred at oil and gas drilling sites in the Middle East and Southeast Asia. Furthermore, due to a lack of accident prevention, the drilling equipment maintenance operation was strongly linked to health and safety risk factors in both drilling domains.

***Key words:*** *drilling wells, industrial security, drilling operation, risk factors, occupational safety*

## Giriş

Neft və qaz sənayesi dünya iqtisadiyyatının inkişafında mühüm rol oynayır. Halbuki, neft və qazma əməliyyatları neft-kimya məhsullarının quru səthindən və dərin dəniz sularından çıxarıldığı əsas əməliyyatlardan biri hesab olunur . Bu əməliyyat neft və qaz qazma briqadasının həyatı üçün təhlükə yaradan risk faktorları ilə yüksək dərəcədə əlaqələndirilir. Sağlamlıq və təhlükəsizlik qaydalarının və qarşısının alınması yanaşmalarının olmaması səbəbindən onilliklər ərzində quruda və dənizdə qazma sahələrində yüzlərlə qəza və ölüm halları qeydə alınmışdır [3, s.89]. Lakin qazma peşəsinin gözlənilməz xarakterinə görə son bir neçə ildə risk faktorlarının yalnız bir neçə faizi nəzarət altına alınıb [4, s.59]. Buna görə də, son 18 ildə quruda və dənizdə qazma sahələrində ən potensial təhlükəsizlik və sağlamlıq risk faktorlarını və ölüm hallarının əsas səbəbini müəyyən etmək. Beləliklə, hər iki qazma sahəsində qəzaların və xəsarətlərin əsas səbəblərini göstərmək üçün geniş və sistemli ədəbiyyat araşdırması aparılmışdır.

**Neft və qaz quyularının qazılması zamanı qarşılaşılan fəlakətlər**

Hər il yüzlərlə insan neft-qaz qazma və hasilat sənayesində öz vəzifələrini yerinə yetirərkən həlak olur, minlərlə insan yaralanır. Gözlənilməz və təhlükəli təbiətə görə bütün dünyada onilliklərdən bəri bir sıra kimyəvi, təhlükəsizlik, ekoloji və erqonomik təhlükələr bildirilmişdir [4, s. 90]. Halbuki, bütün dünya üzrə quruda və dənizdə qazma və texniki xidmət əməliyyatları zamanı həlak olanların və həyati əhəmiyyətli xəsarətlərin sayı göstərilmişdir. On yeddi il ərzində baş vermiş böyük fərarilərin bir neçə əsas səbəbi var [17, s.87].

Bununla belə, qəzaların əksəriyyəti təhlükəsizlik və sağlamlıq qaydalarına və fövqəladə hallar üçün effektiv tədbirlər planına etinasızlıq nəticəsində baş vermişdir. Baxmayaraq ki, yanğın partlayışı, partlama, nəzarətsiz quyu, helikopter və dəniz qəzaları siyahıda birinci yerdədir. Cədvəl 1, son 22 ildə qazma işçiləri arasında tədqiq edilmiş səbəblər və həlak olanların və yaralananların sayı ilə birlikdə neft və qaz qazma və hasilat fəlakətlərinin ətraflı icmalını vurğulayır. Cədvəl 1-dən [2, s. 89] göstərildiyi kimi, neft və qaz fəlakətlərinin və qəzalarının əksəriyyətinin ətraf mühitin müxtəlifliyi, sənaye təhlükəsizliyi və sağlamlıq təcrübələrinin olmaması və qəzaların qarşısının alınması ilə bağlı səmərəli tədbirlərin olmaması səbəbindən Yaxın Şərq və Cənub-Şərqi Asiya ölkələrində qazma prosesi zamanı baş vermişdir.

**Cədvəl 1. Neft və Qaz Fəlakətlərinin İcmalı**

| Ölkə | İl | Fəlakət Səbəbi |
|---|---|---|
| Birləşmiş Ərəb Əmirlikləri | 15 aprel 2000-ci il | Qazma qurğusu çökməsi |
| Brazilya | 15-20 mart 2001-ci il | Yanğın partlayışı |
| Səudiyyə Ərəbistan | 30 sentyabr 2002-ci il | Partlayış |
| Misir | 10 avqust 2004-cü il | Nəzarətsiz Quyu |
| Mumbay | 27 iyul 2005-ci il | Yanğın partlayışı |
| ABŞ | 05 iyun 2006-cı il | Partlayış |
| Səudiyyə Ərəbistan | 18 noyabr 2007-ci il | Boru Xəttinə Baxım zamanı yanğın |
| Avstraliya | 21 avqust 2009-cu il | Neft sızıntısı |
| Meksika Körfəzi | 20 aprel 2010-cu il | Yanğın partlayışı və sızıntı |
| Paria Körfəzi | 13 may 2010-cu il | Qazma qurğusu çökməsi |
| Rusiya | Noyabr 2010 | helikopter alovlanıb və qəzaya uğrayıb |
| Nigerya | 16 yanvar 2012-ci il | Partlayış |
| Malaziya | 11 iyun 2012-ci il | Partlayış |
| ABŞ | 28 oktyabr 2014-cü il | Partlayış |

**Neft və qaz quyularında qazıma prosesi və əlaqəli əməliyyatlar**

Neft və qazın qazılması əməliyyatı neft-kimya sənayesində ən çətin və müasir proseslərdən biridir. Neft və qaz kəşfiyyatı prosesində iştirak edən və onlarla bağlı potensial və həyat üçün təhlükə yaradan risk və təhlükələrin sayı ilə bağlı bir sıra əməliyyatlar və fəaliyyətlər mövcuddur [8]. Quruda neft və qaz qazma əməliyyatı yer səthindən təmizlənmiş neft və qazların kəşfiyyatı üçün yeddi əsas əməliyyatdan ibarətdir. Dənizdə qazma əməliyyatları üçün isə dərin dəniz dibindən uğurlu qazma əməliyyatı üçün cəmi doqquz əməliyyat aparılmışdır. Quruda və dənizdə qazma əməliyyatlarının təfərrüatlı təsvirləri və onlarla əlaqəli fəaliyyətlər Əməyin Təhlükəsizliyi və Sağlamlığı İdarəsi tərəfindən müəyyən edildiyi kimi aşağıda müzakirə olunur [9, s.10]

**Qazıma qurğusunun montajı (assembiliya).** Neft və qaz hasilatı üçün aparılan ən ilkin və ilk əməliyyatlardan biri quruda və dənizdə qazma sahələrində qazma qurğusunun yığılması əməliyyatıdır. Bu əməliyyat zamanı sənaye və ya podratçılar qazma qurğusunu laboratoriya müayinələrindən sonra xam neft və qazın olması geoloji ekspertlər tərəfindən göstərildiyi qazma sahəsinə yerləşdirməlidirlər.Bu əməliyyatın başa çatdırılması üçün bir sıra əsas tədbirlər həyata keçirilmişdir. Halbuki, hər iki qazma sahəsində qazma qurğusunun yığılması eyni dərəcədə təhlükəli və çətin olur (9).

Tapşırıqları yerinə yetirərkən bir çox təhlükəsizlik və erqonomik təhlükələr var. Quruda və dənizdə qazma sahəsində neft və qaz qazma prosesi zamanı qazma qurğusunun yığılması əməliyyatı ilə bağlı fəaliyyətlər Cədvəl 2 [11]-də göstərildiyi kimidir.

**Cədvəl 2.Qazıma qurğusunun montajı əməliyyatları**

| |
|---|
| Qazıma Gövdəsi və Platformasının Montajı |
| Tutacaqların və Pilləkənlərin quraşdırılması |
| Qurğuların Enerji Sisteminin quraşdırılması |
| Sirkulyasiya sisteminin qurulması |

**Qazıma əməliyyatı.** Quyu qazma əməliyyatı neft və qaz qazma qurğusunun yığılmasından sonra ikinci əsas əməliyyatdır. Bu əməliyyatda qazma baltası və boru şəklində yerin səthində və ya dəniz səthinin altında dərin çuxur qazılır. Bu əməliyyat zamanı qazma briqadası adətən boru tipli qazma işləri zamanı, qazma məhlullarının hazırlanması zamanı və quyuların qazılması zamanı radioaktiv materialların təsiri ilə əlaqədar kimyəvi və təhlükəsizlik təhlükələri ilə üzləşirdi. Halbuki, qazma zamanı istifadə olunan təhlükəli mayelərin yanıqlar, partlayışlar, şiddətli kimyəvi reaksiyalar, tənəffüs orqanlarının zədələnməsi, fiziki xəsarətlər, sürüşmə və yıxılma potensialı var [10]. Cədvəl 3 quyuların qazılması zamanı həyata keçirilən fəaliyyətləri vurğulayır.

**Cədvəl 3. Qazıma əməliyyatları ilə bağlı fəaliyyətlər**

| |
|---|
| Qazıma qurğularının hazırlanmas |
| Qazıma məhlulunun hazırlanması |
| Qazıma Prosesi |
| Atqıların quyu dibindən yığılması |

**Boruların dəyişdirilməsi.** Üçüncü qazma əməliyyatında adətən quruda və dənizdə qazma sahələrində qazma borularının uzadılması, qazma bitlərinin dəyişdirilməsi və quyu quyusunun tədqiqi aparılır. Bu əməliyyat zamanı qazıma boruları, ağırlaşdırılmış qazıma boruları, həlqəvi fəza divarı arasında toqquşma və ya ilişmə kimi bir sıra təhlükəsizlik təhlükələri ola bilər[11].

**Sementləmə.** Bu qazma əməliyyatında qazıma quyusuna qazma borularından xeyli böyük olan keyzinq boruları yerləşdirilərək onu dağılmadan qoruyur. Keyzinq və sementləmə əməliyyatı bütün qazma prosesi boyunca aparılır, bu da səth örtüyü və aralıq örtüyü ilə başlayır. Həmçinin quyuların qazılması və sökülməsi əməliyyatı başa çatdıqdan sonra qoruyucu briqada boru kəmərini sementləmə materialı ilə quyu lüləsinə bərkitmişdir. Bundan başqa, bu əməliyyat zamanı quruda və dənizdə quyuların sementlənməsi üzrə dörd fəaliyyət həyata keçirilir.

**Avadanlıqlara texniki xidmət göstərilməsi**. Qazma avadanlığına texniki qulluq əməliyyatı hər iki qazma sahəsində qazma prosesində qeydə alınan yüksək xəsarətlərdən biri hesab edilən bütün proses boyu həyata keçirilmişdir. Çünki çox vaxt quyu qazma əməliyyatı zamanı hansısa obyekt və ya boru kəməri ilişib qaldıqda və ya elektrik generatorlarında texniki və ya mexaniki nasazlıq olduqda texniki qulluq tələb olunur. Buna görə də, bu iş zamanı texniki işçilər maşa ilə vurula, hündürlükdən yıxıla, avadanlıqdan elektrik cərəyanı vura və generatorların təmiri zamanı yanğın və partlayış baş verə bilər [12].

**Quyuya nəzarət.** Quyuya nəzarət əməliyyatında quyu daxilində təzyiqin monitorinqi və tullantıların qarşısını alan qurğuların monitorinqi quruda və dənizdə qazma əməliyyatlarında mühüm və əsas vəzifədir [13, s.90]. Bununla belə, fəlakətlərin çoxu keçmişdə nəzarət olunmayan quyu və qazma sahələrində partlama nəticəsində baş vermiş, daha sonra isə 2010-cu ildə 21 nəfərin öldüyü dərin horizonta dəniz qazma hadisəsində olduğu kimi yanğın və partlayışa çevrilir.

## Neft və qaz qazma təhlükəsinin təsnifatı

Neft və qazın qazılması prosesi mürəkkəb və həyat üçün təhlükə yaradan fəaliyyət və hadisələrə görə həmişə təbiətdə ən çətin və təhlükəli proseslərdən biri hesab olunur [4]. Bununla belə, quruda və dənizdə neft və qaz qazma əməliyyatları ilə əlaqəli bir sıra potensial təhlükələr mövcuddur [9, s.110].

Onların əksəriyyəti aşağıda müzakirə edildiyi kimi təhlükəsizlik, kimyəvi, erqonomik və ətraf mühit təhlükələri kimi dörd əsas kateqoriyaya bölünür:

**Əmək təhlükələri.** Təhlükəsizlik təhlükələri demək olar ki, hər bir sənaye şəraitində ən çox rast gəlinən və tez-tez baş verən iş yeri təhlükələrindən biridir. Neft və qaz kəşfiyyatı əməliyyatlarında əmək təhlükələri həm də dənizdə və dənizdə qazma sahələrində ən ümumi təhlükələr kateqoriyasından biri kimi bildirilir [16, s.78]. Bundan əlavə, neft və qaz qazma işləri zamanı təhlükəsizlik və sağlamlıq mütəxəssisləri tərəfindən müəyyən edilmiş əmək fəaliyyəti təhlükələri sürüşmə, hündürlükdən düşmə, cismin düşməsi, avadanlıq tərəfindən ilişib qalması, qorunmayan mexanizmlər, elektrik təhlükələri və məhdud kosmik təhlükələrdir [10, s.89].

**Kimyəvi təhlükələr.** Hər il neft və qazın qazılması prosesində təhlükəli qazma məhlulları ilə düzgün işlənilməməsi nəticəsində çoxlu sayda xəsarət və kritik yanıqlar qeydə alınır [7, s. 90]. Neft və qaz kəşfiyyatı prosesində quyuların qazılması əməliyyatı və H2S və kimyəvi monitorinq əməliyyatı kimyəvi təhlükələrlə yüksək dərəcədə əlaqələndirilir, çünki bu qazma fəaliyyətləri zamanı qazma briqadası bir neçə qazma məhlulu və kimyəvi tərkibli məhlullarla məşğul olmalıdır. Bundan əlavə, neft və qaz qazma prosesi zamanı bəzi kimyəvi təhlükələr təhlükəli qazma məhlulları, təbii olaraq yaranan radioaktiv materiallar (NORM), yanğın və Hidrogen Sulfid (H2S) kimi ölümcül qazlara məruz qalma ilə əlaqədardır [18, s.87].

**Erqonomik təhlükələr.** Neft və qazın qazılması prosesi erqonomik təhlükələrlə çox bağlıdır, çünki hər bir fəaliyyət zamanı qazma briqadası çoxsaylı fiziki fəaliyyətlər yerinə yetirməli olur [15, s.99]. Halbuki, bu texnoloji dövrdə qaldırma və daşıma fəaliyyətlərinin əksəriyyəti ən son maşınlar və ya kranlar vasitəsilə həyata keçirilir, lakin hələ də düzgün olmayan idarəetmə və qaldırma strategiyaları səbəbindən erqonomik xəsarətlərin dərəcəsi sürətlənir. Quruda və dənizdə qazma sahələrində erqonomik təhlükələr qazma borularının düzgün qaldırılmaması, rəftar zamanı pis duruş, yöndəmsiz və ya qəfil hərəkətlər, eyni hərəkətlərin təkrarlanması, tapşırıqlar zamanı həddən artıq güc tətbiq edilməsi səbəbindən bildirilmişdir.

**Ətraf mühit təhlükələri.** Ekoloji təhlükələr həm də bütün dünyada neft və qaz sənayesinin əsas problemlərindən biridir [20]. Bununla belə, ekoloji risklərlə bağlı qəzaların nisbəti dənizdəki qazma sahəsində quru ilə müqayisədə yüksək səviyyədə bildirilmişdir. Bundan əlavə, bu ekoloji təhlükələr dənizdə qazma işləri zamanı dəniz və vertolyot əməliyyatlarına təsir göstərmişdir. Həmçinin, dəniz üçün son dərəcə təhlükəli ola biləcək ciddi narahatlıqlardan biri də budur. ətraf mühit və dəniz həyatı hasilat və qazma prosesi zamanı böyük miqdarda neft dağılmasıdır [19].

## Nəticə

Hər il yüzlərlə qazma briqadasının üzvü neft və qaz qazma sahələrində sağlamlıq və təhlükəsizliklə bağlı narahatlıqlar səbəbindən həyatı üçün təhlükə yaradan və çətin vəziyyətlərlə üzləşir. Buna görə də, neft və qaz qazma əməliyyatları ümumi sənaye ilə müqayisədə tikinti sənayesindən üç dəfə, iki dəfə daha təhlükəli hesab olunur. Beləliklə, quruda və dənizdə qazma sahələrində potensial təhlükələri və təhlükəli neft və qaz qazma əməliyyatlarını göstərmək üçün bu geniş ədəbiyyat icmalı son 22 il ərzində dərc edilmiş işlərə əsaslanaraq aparılmışdır.Bu təhlil sənədinin ümumi nəticələrinə əsasən, müəyyən edilmişdir ki, neft və qaz qazma əməliyyatları quruda və dənizdə eyni dərəcədə təhlükəlidir. Halbuki, texniki xidmət əməliyyatı hər iki qazma sahəsində təhlükəsizlik, erqonomik, ətraf mühit və kimyəvi təhlükələrlə yüksək dərəcədə əlaqəli idi.

## Ədəbiyyat

1. A Compendium of NIOSH mining research, 2002. Retrieved from:https://stacks.cdc.gov/view/ cdc/5224
2. A story of impact: NIOSH and partners work to prevent worker deathsfrom exposures to hydrocarbon gases and vapors at oil and gas wellsites,2016. Retrieved from: https://stacks.cdc.gov/view/cdc/43945
3. A story of impact: NIOSH and partners work to prevent worker deathsfrom exposures to hydrocarbon gases and vapors at oil and gas wellsites,2016. Retrieved from: https://stacks.cdc.gov/view/cdc/43945

4. Asad, M.M., Asad, M.M. and Hassan, R.,. Development of KBES withhazard controlling factors and measures for contracting health and safetyrisk in oil and gas drilling process: a conceptual action plan. The SocialScience 12(13), 2017
5. Asad, M.M., Hassan, R.B., Ibrahim, N.H., Sherwani, F. and Soomro,Q.M,. Indication of Decision Making through Accident PreventionResources among Drilling Crew at Oil and Gas Industries: AQuantitative Survey. In Journal of Physics: Conference Series (Vol.1049, No. 1, p. 012022). IOP Publishing, 2018.
6. Asad, M.M., Hassan, R.B., Sherwani, F., Ibrahim, N.H. and Soomro,Q.M,. Level of Satisfaction for Occupational Safety and Health TrainingActivities: A Broad-Spectrum Industrial Survey. In Journal of Physics:Conference Series (Vol. 1049, No. 1, p. 012021). IOP Publishing, 2018
7. Clarke, S. and Cooper, C. Managing the risk of workplace stress: Healthand safety hazards. Routledge, 2004
8. Diesel aerosols and gases in underground mines; guide to exposureassessment and control, 2011. Retrieved from:https://stacks.cdc.gov/view/cdc/6129
9. DOSH 2014 Annual Safety and Health Report. Retrieved from:http://www.dosh.gov. my/index. php/en/archive-statistics/2014
10. Hassan RB, Asad MM, Soomro QM, Sherwani F. Severity of the Casingand Cementing Operation with Associated Potential Hazards in theDrilling Process in the On and Offshore Oil and Gas Industry: A Cross-Sectional Investigation into Safety Management. Pertanika Journal ofSocial Sciences & Humanities. 2017 Apr 2
11. Health and safety risks for workers involved in manual tank gauging andsampling at oil and gas extraction sites, 2015. Retrieved from:https://stacks.cdc.gov/view/cdc/44795
12. Measurement of Area and Personal Breathing Zone Concentrations ofDiesel Particulate Matter (DPM) during Oil and Gas ExtractionOperations, including Hydraulic Fracturing, 2018. Retrieved from:https://stacks.cdc.gov/view/cdc/54143
13. Morbidity and mortality weekly report, 2017. Retrieved from:https://stacks.cdc.gov/ view/cdc/ 45318
14. NIOSH Oil and Gas Extraction Program, NIOSH, 2015. Retrieved from:https://stacks.cdc.gov/ view/cdc/39918
15. NIOSH science awards results booklet for 2017 program, 2017.Retrieved from: https://stacks. cdc.gov/view/cdc/45524
16. Nolan, D.P.. Handbook of fire and explosion protection engineeringprinciples: for oil, gas, chemical and related facilities. William Andrew,2014
17. Occupational Exposures in the Oil and Gas Extraction Industry: State ofthe Science and Research Recommendations, 2014. Retrieved from:https://stacks.cdc.gov/view/cdc/31655
18. Occupational Fatalities Resulting from Falls in the Oil and GasExtraction Industry, United States, 2005–2014, MMWR, 2017.Retrieved from: https://stacks.cdc.gov/view/cdc/55777
19. OSHA. Safety Hazards Associated with Oil and Gas ExtractionActivities. 2016.
20. Ridl S, Retzer KD, Hill RD. Oil and gas extraction worker fatalities2014: NIOSH Fatalities in Oil and Gas Extraction (FOG) database.
21. Salvendy G. and Karwowski W. Advances in human factors,ergonomics, and safety in manufacturing and service industries. CRCPress, 2010

**Rəyçi: prof. N.Zeynalov**

Göndərilib: 12.02.2022 Qəbul edilib: 07.03.2022

**Sxem 2. Milli və xarici valyutada olan pulların mübadiləsi zamanı kommersiya banklarının funksiyaları**




***Mənbə:***
*Демичев А. Банковский сектор и экономика // Экономист. - 2011. - N 11. - С.55-60 məqaləsinin materialları əsasında müəllif tərəfindən hazırlanmışdır.*

Sxem 2-də qeyd olunan funksiyaları kommersiya bankları öz əməliyyatları vasitəsilə yerinə yetirirlər. Belə əməliyyatlar passiv, aktiv, eləcə də vasitəçilik əməliyyatları hesab olunur. Kommersiya banklarının həyata keçirdikləri əməliyyatları qruplaşdırarkən diqqət olunması zəruri olan əsas məsələ onların maliyyə ehtiyatlarının yaradılması və düzgün yerbəyer edilməsidir. Kommersiya banklarının maliyyə ehtiyatları dedikdə, bankların passiv və eləcə də aktiv əməliyyatları həyata keçirmək üçün istifadə etdikləri vəsaitləri başa düşülür.Kommersiya banklarının aktiv əməliyyatları dedikdə, banka cəlb olunan vəsaitlər, başqa sözlə desək, bankın depozit kimi qəbul etdiyi vəsaitlər başa düşülür.Kommersiya banklarının passiv əməliyyatları dedikdə isə bank tərəfindən vətəndaşlara verilən kreditlər başa düşülür. Yəni banka daxil olan pul vəsaitləri bankın aktiv əməliyyatları hesab olunursa, bankdan çıxan pul vəsaitləri bankın passiv vəsaitləri kimi qəbul olunur.

Kommersiya banklarının xüsusi kapitalı dedikdə, banka məxsus olan kapital başa düşülür. Başqa sözlə desək, bankın xüsusi kapitalı onun nizamnamə kapitalından ibarətdir. Lakin bununla yanaşı, hər bir kommersiya banklarının xüsusi kapitalı ilə yanaşı ehtiyat vəsaitlərinin toplandığı xüsusi fondları da olur.

Kommersiya bankları özlərinin passiv əməliyyatlarını bir neçə formada həyata keçirə bilir (Панова Г.С., 2018, с. 37):

- Bankda mövcud olan qiymətli kağızların emissiya olunması vasitəsilə;
- Bankda yeni fondlar formalaşdırmaq, eləcə də bankın sahib olduğu fondları yeniləmək üçün bankın mənfəətindən xüsusi ayırmalar etməklə;
- Kommersiya banklarının öz borclarını ödəmək məqsədilə digər kommersiya banklarından kredit alması vasitəsilə.

Kommersiya banklarının xüsusi əhəmiyyətli əməliyyatlarından biri də depozit əməliyyatlarıdır. Depozitlər müxtəlif xüsusiyyətlərə görə qruplaşdırıla bilərlər. Qoyulma müddətinnə görə, eləcə də qoyulma valyutasına görə, hansı şərtlərlə qoyulub, hansı şərtlərlə geri ödənməsi xüsusiyyətlərinə görə depozitlər mühim əhəmiyyətə malikdirlər. Depozit əməliyyatlarının subyektləri və obyektləri olur. Belə ki, banklar depozit əməliyyatlarının subyekti qismində çıxış edirsə, pul vəsaitləri kommersiya banklarının əsas obyekti rolunda çıxış edir.

Subyekt baxımından depozit əməliyyatları fiziki və hüquqi şəxs qismində çıxış edə bilər. Müddətinə görə isə depozitlər müddətli və tələb olunan müddətə geri götürmək xüsusiyyətinə malik olurlar. Müddətli formada qoyulan depozitlər digərləri ilə müqayisədə daha yüksək rentabelliliyə malik olur. Belə ki, Azərbaycan Respublikasında müddətli depozitlər üzrə faiz dərəcələri 11-14% arasında dəyişir. Lakin tələb olunan müddətə qədər qoyulan depozitlərdə isə faiz dərəcələri daha az olur. Bunun da əsas səbəbi kimi maliyyə resurslarının gözlənilməyən anda bankın passiv əməliyyatına çevrilmə potensialı ilə əlaqələndirilir. Maliyyə vəsaitlərinin tiplərinə görə isə depozitlər əmanət kitabçalarındakı vəsaitlərə və plastik kartlardakı vəsaitlərə bölünürlər. Faiz dərəcələrinə görə isə depozitlər təsbit olunan faiz dərəcəsi ilə qoyulan depozitlərə və üzən dərəcə üzrə qqoyulan depozitlərə bölünür.

Bankın passiv əməliyyatları pul vəsaitlərinin bankdan çıxmasını təmin etsə də gəlir gətirmək məqsədi ilə həyata keçirilir. Kommersiya banklarının passiv əməliyyatlarını iki əsas qrupda təsnifləşdirmək olar (Шаламов Г.А., 2014, с. 102):

- Kommersiya banklarının likvidlik səviyyəsini normada saxlamaq məqsədilə həyata keçirilən əməliyyatlar;
- Kommersiya banklarının gəlir əldə etmək məqsədilə həyata keçirdikləri kredit əməliyyatları.

Kommersiya banklarında həyata keçirilən kassa əməliyyatları nağd pul üzərində qurulan əməliyyatlardır. Başqa sözlə desək kassa əməliyyatları nağd pulların hərəkətini təmin edən əməliyyatlardan hesab olunur.

Kommersiya bankları bəzi hallarda investisiya əməliyyatları da həyata keçirə bilir. İnvestisiya əməliyyatlarının həyata keçirilməsində əsas məqsəd kommersiya banklarının iqtisadiyyatın hansısa bir sahəsinə yatırım etməklə öz mənfəətini daha da artırmaqdır. İnvestisiya əməliyyatları da bankdan pulların çıxmasını təmin etdiyi üçün passiv əməliyyatlara aid edilə bilər. Lakin əsas məqsəd qeyd etdiyimiz kimi daha yüksək mənfəətin əldə olunmasını təmin etməkdir.

Kommersiya banklarının həyata keçirdikləri digər bir əməliyyat növü isə trass əməliyyatlar hesab olunur. Trast əməliyyatları dedikdə, əmlak sahibinin öz əmlakını idarə etmək məqsədilə başqa bir şəxsə verməsi başa düşülür. Trast əməliyyatlarında əmlak növü kimi daşınmaz əmlakla yanaşı, eyni zamanda da qiymətli kağızlar və pullar çıxış edir. Trast əməliyyatlarının iştirakçıları qismində isə trastı təsis edən, benefisiar və əmlakı güvənlə idarə edən şəxslər çıxış edir.

## Nəticə

Kommersiya bankı mənfəət əldə etmək məqsədi pul dəyəri ilə məşğul olan bank kimi tanınır. Kommersiya bankı kapital dileri və ya daha doğrusu pul dileridir. Bu bank əmanətçilərə minimum faiz verir və borcalandan maksimum faiz tələb edir. Bu proseslərlə kommersiya bankları qazanc əldə edir və bizneslərini davam etdirirlər.

Kommersiya bankları qazanc əldə etmək məqsədi daşıyan biznes müəssisəsidir, lakin kredit təşkilatları iqtisadiyyata bəzi unikal xidmətlər də təqdim edirlər. Banklar vasitəsilə iqtisadiyyat tənzimlənir və iqtisadi inkişaf təmin edilir. Beləliklə, kommersiya bankı dövlət və əhali üçün bir sıra fəaliyyətlər həyata keçirir. Kommersiya bankları maliyyə resursları ilə zəngin olan şəxslərdən aşağı faizlə əmanətləri cəlb edərək investisiya üçün kapital təmin edir və beləliklə, boş əmanətləri səfərbər etməklə iqtisadiyyatda kapital yaradır.

Banklar, xüsusən də kommersiya bankları dövlət pullarının təhlükəsiz saxlanması və ya depoziti üçün təşkilatlardır. Banklar həm də dövlət pulu üçün risksiz investisiyalardır. Banklar sabit cari əmanət sertifikatı kimi müxtəlif növ əmanətlər təqdim edir. Bu əmanətlər müştərinin pulunun təhlükəsizliyini təmin edir və həmçinin depozitə qoyulan puldan müəyyən qədər gəlir əldə etməyi təmin edir.

## Ədəbiyyat

1. Abbasov Ə., Həmişəyeva Ş., Məmmədov Z., Rzayev R. Bank işi ilə elektron bankçılıq. Bakı 2013, 420 s.
2. Abdullayev Ş.Ə., Əsgərova R.V. "Bank işi" Dərslik- 2017, 510 s.
3. Bağırov M.M. "Banklar və bank əməliyyatları" Dərslik. 2014, 480 s.
4. Bəşirov R.A. "Bank işi" Dərslik. 2017, 420 s.

5. Cavadov A.M., Kommersiya bankları məhsul və xidmətlərinə qiymət-qoyma. Bakı 2012, 480 s.
6. Əliyev M.F. Bankların inkişaf istiqamətləri. Monoqrafiya. Bakı, "Şərq-Qərb" Nəşriyyat evi, 2014, 120 səh.
7. Əliyev M.F., Bank məhsullarının inkişaf strategiyası. 2016, 346 s.
8. Əliyev M.F., Bank məhsullarının inkişaf strategiyası. İqtisadiyyat və audit jurnalı, 2013-cü il, №8.
9. Əliyev M.F., Bank islahatları ilə vahid reytinq sistemi ilə qiymətləndirmə. Ekspert jurnalı, 2016-ci il, №3-4.
10. Hacıyeva L.A. "Xidmət sahələrinin marketinqi" Dərs vəsaiti - Bakı, 2017. 276 səh
11. Məmmədov Z.F. Bank fəaliyyətinin əsasları. (Elmi-nəzəri və praktki məlumat kitabı). Bakı, Azərnəşr. 2017. səh.480.
12. Abbasov I., Khankishiev B. Commercial bank in the transition to a market economy. Baku - 2018. 600 p.
13. Agarkov M.M., Fundamentals of banking. M. 2019, 540 p.
14. Vikulin A.Yu., Antimonopoly regulation of the banking services market. M. 2015, 652 p.
15. Greenspan A. Commercial banks and the Central Bank in a market economy // Vopr. economy. - 2014. -N 12. - S.87-96.
16. Demichev A. Banking sector and economy // Economist. - 2011. - N 11. - S.55-60.
17. Chechetkina T. Small commercial banks: problems, prospects / T. Chechetkina, V. Petushkov // Economist. - 2012. - N 8. - S.89-93.
18. Shalamov G.A. "Small" problems of the provincial bank in the mirror of the big economy // Society and Economics. - 2014. - N 9-10. - P.100-105.
19. Shvetsov Yu.G. Bank capital: its sufficiency and functions / Yu.G. Shvetsov, V.G. Koreshkov // Money and credit. - 2014. - N 6. - S.34-36.

**Rəyçi: iqtisad e.f.d. A.Hüseynova**

Göndərilib: 18.02.2022 Qəbul edilib: 18.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/85-89

**Cəmilə Nəriman qızı Bayramlı**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
camilabayramli@gmail.com

# BÖHRANIN DÜNYA ÖLKƏLƏRİNDƏKİ PUL-KREDİT SİYASƏTİNİN TƏNZİMLƏNMƏSİNƏ TƏSİRİ

**Xülasə**

İstənilən ölkənin iqtisadi inkişafı həm bazar mexanizmlərinin hərəkəti ilə, həm də dövlətin iqtisadiyyata təsiri ilə baş verir. İqtisadi proseslərə dövlət müdaxiləsinin istiqamətlərindən biri də pul siyasətidir. Pul (pul) siyasəti dövlətin mərkəzi bankın simasında pul və maliyyə-kredit sektorlarında ölkənin iqtisadi inkişafının müəyyən strateji məqsədlərinə nail olunmasına yönəlmiş tədbirlər məcmusudur.

Məqalədə böhranın dünya ölkələrindəki pul-kredit siyasətinin tənzimlənməsinə təsiri təhlil edilir. Antiböhran tədbirlərinin həyata keçirilməsi nöqteyi-nəzərindən pul siyasətinin daha geniş spektrli vəzifələrə tabe edilməsi istiqamətində dəyişdirilməsi imkanları nəzərdən keçirilir.

***Açar sözlər:*** *pul, siyasət, böhran, dünya ölkələri*

**Jamila Nariman Bayramli**

## The impact of the crisis on the regulation of monetary policy in the world countries

**Abstract**

The economic development of any country takes place both through the movement of market mechanisms and the influence of the state on the economy. One of the directions of state intervention in economic processes is monetary policy. Monetary policy is a set of measures aimed at achieving certain strategic goals of economic development of the country in the monetary and financial-credit sectors of the state in the person of the central bank.

The article analyzes the impact of the crisis on the regulation of monetary policy in the world. From the point of view of the implementation of anti-crisis measures, the possibility of changing monetary policy to a wider range of tasks is being considered.

***Key words:*** *money, politics, crisis, countries of the world*

## Giriş

Hər bir ölkə üçün pul dövriyyəsi və kredit sahəsində siyasət mühüm əhəmiyyət kəsb edir. Pul siyasəti dövlətin iqtisadi siyasətinin əsas elementi və mühüm tərkib hissəsidir, milli, eləcə də qlobal iqtisadi proseslərin inkişafındakı roluna görə mühümdür. Bu onunla bağlıdır ki, pul siyasəti pul təklifini və pul bazarını tənzimləməklə iqtisadiyyatın səmərəli fəaliyyətini təmin etmək məqsədi daşıyır. Eyni zamanda, onun əsas məqsədləri məzənnə sabitliyi, qiymət sabitliyi, tədiyə balansının tarazlaşdırılması, məşğulluq, əhalinin rifahının yüksəldilməsi və s. Pul siyasəti dedikdə, dövlət tərəfindən öz mərkəzi bankı vasitəsilə həyata keçirilən pul bazarının tənzimlənməsi üzrə müəyyən məqsədlərə nail olmaq üçün qarşılıqlı əlaqə ilə əlaqələndirilmiş tədbirlər kompleksi başa düşülür. Ölkənin pul siyasətinin formalaşmasında həlledici rolu Milli Bank oynayır.

Pul siyasətinin ən mühüm vəzifəsi ölkənin iqtisadi yüksəlişinə şərait yaratmaqdır. Lakin bu siyasətin, bu vəzifənin həyata keçirilməsinə töhfəsi çox vaxt qiymət sabitliyinin təmin edilməsi ilə məhdudlaşır. Bu arada qlobal maliyyə-iqtisadi böhran və onun nəticələrinin aradan qaldırılması üzrə beynəlxalq təcrübə göstərdi ki, qiymət sabitliyi uzunmüddətli iqtisadi artım üçün zəruri, lakin kifayət deyil. Bu məqsədə nail olmaq üçün kommersiya banklarının təsərrüfat subyektlərinin inkişafında iştirakının gücləndirilməsi tələb olunur. Bununla belə, pul institutlarının maliyyə nəticələrinə

yönəldilməsi ümumi iqtisadi məqsədlərlə ziddiyyət təşkil edir ki, nəticədə bu da iqtisadi inkişafın hədəfləri arasında tarazlığa nail olmaq yollarının axtarışını zəruri edir.

Maliyyə-iqtisadi böhrandan əvvəlki dövr bankların kredit portfelinin yüksək artım templəri ilə səciyyələnir. Lakin böhran dövründə kreditləşmənin kəskin azalması həm inkişaf etmiş, həm də inkişaf etməkdə olan ölkələrdə tənəzzülü daha da kəskinləşdirən əsas səbəblərdən biri idi. Bu iqtisadi artımın təmin edilməsində, mərkəzi bankın bazarın kontruktiv tənzimlənməsinə yönəlmiş siyasətinin təşviqində kommersiya banklarının çox ziddiyyətli rolundan xəbər verir. Bir tərəfdən kommersiya bankları pul-kredit institutları kimi iqtisadiyyatın inkişafına töhfə verməlidirlər, digər tərəfdən isə özəl şirkətlər kimi obyektiv olaraq öz maraqlarını milli maraqlardan üstün tutur-lar. Beləliklə, tənəzzül zamanı onlar kreditlərin həcmini azaldır, bərpa və bərpa zamanı isə əksinə, tez-tez kreditin sərhədlərini pozur və əslində bazar prosesinin iştirakçılarını "yenidən maliyyələşdirir". Kommersiya banklarının fəaliyyətində istənilən ifrata varması, onların bazarın inkişafının obyektiv qanunlarını pozması və milli maraqları bilməməsi iqtisadi artıma, bazar proseslərinin tarazlı inkişafına mənfi təsir göstərir.

## Analiz

Bu gün dünya o qədər bir-birinə bağlıdır ki, hətta nisbətən əlverişli makroiqtisadi göstəricilərə malik olan ölkələr də başqa ölkələrdə yaranmış böhran hadisələrinin təsirinə məruz qala bilərlər. Böhranların çirklənmənin təsiri ilə yayılması həm real iqtisadiyyatın kanalları (xarici ticarətin qarşılıqlı əlaqəsi vasitəsilə), həm də maliyyə sektoru vasitəsilə (kapitalın transsərhəd hərəkəti yolu ilə) baş verə bilər (Julien Brault, Simone Signore, 2020, 210 p.).

Xarici şoklar əvvəlcə ayrı-ayrı milli iqtisadiyyatlarda və ya regionlarda, sonra isə bütün dünya iqtisadiyyatında (2007-2009) böhran hadisələrinə səbəb oldu. Pul siyasətinin bu cür böhranlara yanaşmaları və reaksiyaları davamlı olaraq modernləşdirilir. İnkişaf etmiş ölkələrdə ən əhəmiyyətli böhranlar, bir qayda olaraq, təsirlənir iqtisadiyyatın yalnız müəyyən sahələrinə təsir göstərmiş və bütövlükdə iqtisadiyyata məhdud təsir göstərmişdir (1992–1993-cü illərdə Avropada valyuta böhranı, 2000–2002-ci illərdə inkişaf etmiş ölkələrin fond bazarında böhran). Onların nəticələri ya monetar siyasətin yumşaldılması (2000-ci illərin əvvəllərindəki fond böhranı) və ya onun rejiminin dəyişdirilməsi (Avropa məzənnə mexanizminin dəyişdirilməsi və 1990-cı illərin əvvəllərində bir sıra ölkələrin ondan çıxması) ilə aradan qaldırıldı.

İnkişaf etməkdə olan ölkələrdə 1994-2002-ci illərdə bir sıra böhranlar Milli iqtisadiyyatlara böyük zərbələr vurdu. Eyni zamanda, beynəlxalq maliyyə qurumlarının tövsiyələri sırasında demək olar ki, bütün hallarda pul-kredit siyasətinin sərtləşdirilməsi və milli valyutanın məzənnəsinin dəstəklənməsinə ehtiyac var idi (Enock Nyorekwa Twinoburyo, Nicholas M., 2018; p. 123-137).

2007-ci ildə başlayan qlobal maliyyə böhranı zamanı bir çox mərkəzi banklar maliyyə bazarındakı sıxıntıları aradan qaldırmaq, hasilatı artırmaq və inflyasiyanın sabitləşməsi üçün pul siyasətini aqressiv şəkildə yumşaltdılar. Pul siyasəti maliyyə bazarının sıxıntısını yumşaltmaqda böyük ölçüdə uğurlu oldu, lakin bir çox inkişaf etmiş iqtisadiyyatlarda hasilat artımı və inflyasiya gözləniləndən aşağı qaldı və bərpalar geniş şəkildə məyusedici dərəcədə ləng olaraq qəbul edildi. Bu müşahidələr qlobal maliyyə böhranı ilə əlaqədar pul siyasətinin ötürülmə kanallarının zədələnib- pozulmadığı və onların nəticələri zamanı monetar siyasətin ümumiyyətlə daha az effektiv olub-olmaması ilə bağlı geniş müzakirələrə səbəb olmuşdur.

Maliyyə böhranları pul siyasətinin ötürülməsinə təsir edə biləcək bir sıra xüsusiyyətlər nümayiş etdirir:

- yüksək maliyyə bazarı çətinliyi,
- makroiqtisadi dəyişkənlik və qeyri-müəyyənlik,
- bazar iştirakçılarının aşağı inamı, firmaların və ev təsərrüfatlarının balansında əhəmiyyətli düzəlişlər.

Bütün bu mənfi xüsusiyyətlər pul siyasətinin ötürülməsinə mane ola bilər. Xüsusilə, banklar kredit tədarükünü genişləndirmək istəməyə bilər, çünki onlar daha yüksək kredit defolt riski ilə üzləşirlər və əvvəlki itkilərdən sonra balanslarını tənzimləməlidirlər. Həmçinin maliyyə böhranlarından əvvəl adətən aktivlərin qiymətində baloncuklar, kredit və istehlak partlayışı baş verir, nəticədə adətən ev təsərrüfatlarının, firmaların borclarının azaldılması və riskdən yayınmanın artması ilə müşayiət olunur (White, W.R., 2013; p. 234).

Deməli, belə dövrlərdə monetar orqan tərəfindən müəyyən edilmiş faiz dərəcəsindən asılı olmayaraq kredit tələbi və təklifi zəif qala bilər ki, bu da pul siyasətinin kredit kanalına mane olur.

Pul siyasətinin faiz kanalı dəyərsizləşə bilər, çünki yüksək qeyri-müəyyənlik dövründə investorlar geri dönməz investisiya qərarlarını əlavə məlumat gələnə qədər təxirə sala bilərlər. Bundan sonra qeyri-müəyyənlik investisiya qərarlarının əsas determinantına çevrilir, pul siyasəti isə öz təsirini itirir.

Eynilə, firmaların və istehlakçıların öz bizneslərinə və ya məşğulluq perspektivlərinə inamı aşağı olduqda, investisiyanın faiz dərəcəsinə reaksiyası azala bilər  Nəhayət, mərkəzi banklar üçün hasilatı sabitləşdirmək çətinləşə bilər, çünki yüksək makroiqtisadi dəyişkənlik dövründə firmalar qiymətlərini daha tez-tez tənzimləyirlər .

Digər tərəfdən, pul siyasəti müdaxiləsi, əgər o, bəzi mənfi maliyyə böhranı xüsusiyyətlərini yumşaltsa və beləliklə, maliyyə sektoru ilə real iqtisadiyyat arasında mənfi əks əlaqənin qarşısını ala bilsə və bununla da kredit və faiz kanalının fəaliyyətini bərpa edə bilsə, xüsusilə təsirli ola bilər.

Böhrandan sonrakı dövrdə mərkəzi bankların prioriteti qiymət sabitliyidir. Ukrayna Prezidenti yanında İqtisadi İslahatlar Komitəsi tərəfindən hazırlanmış 2011-2014-cü illər üçün "Varlı cəmiyyət, rəqabətqabiliyyətli iqtisadiyyat, səmərəli dövlət" iqtisadi islahatlar proqramı maliyyə sektorunun uğurunun göstəricisidir və 2014-cü ilə qədər 5-6% inflyasiyaya nail olmuşdur. Bu təlimatdan Milli Bank pul siyasətinin aparılması prosesində istifadə etməlidir.

Pul siyasəti maliyyə bazarının likvidliyini təşviq etməli, onun faiz siyasətinin səmərəliliyini artırmalı, bankların likvidliyinin idarə edilməsini təkmilləşdirməli, makroiqtisadi modelləşdirmə və proqnozlaşdırma sistemini inkişaf etdirməlidir (https://www.labirint.ru/books/417723/).

Bütövlükdə, MBU-nun pul siyasətinin vəzifələri maliyyə və makroiqtisadi sabitliyin təmin edilməsinə, banklara dövlətin iqtisadi siyasətinə nail olmaq üçün şəraitin yaradılmasına yönəlib ki, bu da pul siyasəti alətlərinin, habelə onun səlahiyyətlərinin genişləndirilməsini tələb edir. Buna əsasən və kəmiyyət parametrləri nəzərə alınmaqla: inflyasiya, proqnozlaşdırılan ÜDM dinamikası, valyuta məzənnəsi, tədiyyə balansı pul siyasətinin inkişafının əsas istiqamətlərini, o cümlədən həyata keçirilməsi qiymət sabitliyini təmin edən əsas istiqamətləri müəyyən etmək mümkündür. Bu istiqamətlər aşağıda göstərilən cədvəldə öz əksini tapmışdır.

**Cədvəl 1. Pul siyasətinin inkişafının əsas istiqamətləri**

| Hədəflər | Əsas göstəricilər | Göstəricilərin əsas indeksləri |
|---|---|---|
| 1. Qiymət sabitliyi | - ÜDM<br>-inflyasiya indeksi<br>-vətəndaşların real pul gəlirləri | - adi istehlak qiymətləri indeksi<br>- əsas istehlak qiymətləri indeksi |
| 2. Məzənnə siyasəti | - məzənnə<br>- qızıl-valyuta ehtiyatlarının həcmi<br>- valyuta bazarına müdaxilələr<br>- xarici borcun məbləği<br>- tədiyyə balansı | - öhdəliklərin dollarlaşma səviyyəsi<br>- məzənnə dinamikası<br>- beynəlxalq ehtiyatlar<br>- xalis beynəlxalq ehtiya |
| 3. Faiz siyasəti | -NBU endirim dərəcəsi<br>- yenidən maliyyələşdirmə dərəcəsi<br>- kreditlər və depozitlər üzrə faiz dərəcələri | -açıq bazar əməliyyatları<br>- depozit əməliyyatları<br>- bankların yenidən maliyyələşdirilməsi |
| 4. Pul bazası, pul kütləsi | - məcburi rezervasiya standartları<br>- pul multiplikatoru<br>- pulun hərəkət sürəti | -banklardan kənar pul<br>- pul kütləsinin strukturunda nağd pulun miqdarı<br>- məcburi ehtiyatlar<br>- pul emissiyası:<br>- valyuta bazarı<br>- Fond bazarı<br>- kredit bazarı |

**Mənbə: Müəllif tərəfindən tərtib edilmişdir**

Kredit bazarı pul bazarının törəməsidir, ona görə də pul bazarının aktivləşməsi, pul kütləsinin artması, onun strukturunun dəyişməsi avtomatik olaraq kredit bazarında müvafiq dəyişikliklərə gətirib çıxarır.

Pul siyasəti aparılarkən onun maliyyə sistemi ilə qarşılıqlı əlaqəsi mühüm rol oynayır. Bir daha pul siyasəti üçün (qiymət və maliyyə sabitliyi üzrə) "ikili mandat"ın elan edilməsi aktuallaşıb. Bununla belə, maliyyə sabitliyini təmin edən alətlər problemi həll edilməmiş qalır, çünki bu məqsədə nail olmaq üçün pul siyasəti alətlərindən (məsələn, faiz dərəcəsi) istifadə digər məqsədlərə (ilk növbədə, qiymət sabitliyi) nail olmaq ilə ziddiyyət təşkil edə bilər.

Bunun həlli üçün prudensial tənzimləmə alətlərindən istifadə etmək, sistemli maliyyə riskləri ilə bağlı makroiqtisadi problemlərin həlli üçün zərurət yarandıqda onu dəyişdirmək üçün nəzərdə tutulmuş makroprudensial siyasət konsepsiyası hazırlanmışdır. Bundan əlavə, maliyyə şoklarının transsərhəd ötürülməsi faktorunun əhəmiyyətli təsiri ilə əlaqədar olaraq, milli sərhədlərdən kənarda fəaliyyət göstərən makroprudensial alətlərin hazırlanması zərurəti də etiraf edilir. Bunlara banklar üçün kontrtsiklik kapital buferlərinin tətbiqi ilə bağlı beynəlxalq müqavilələr və qlobal sistem əhəmiyyətli bankların zərərlərinin ödənilməsi üçün əlavə tədbirlər daxildir. Bu faktiki olaraq pul sferasının iqtisadiyyatda təcrid olunmadığını və onun maliyyə bazarlarının inkişafı ilə sıx bağlı olduğunu etiraf edir.

Qloballaşma şəraitində dünya ölkələrinin mərkəzi bankları arasında əməkdaşlığın qurulması son dərəcə vacibdir. Mövcud böhran belə əməkdaşlığa nümunələr verdi: 2008-ci ilin oktyabrında böhranın ən yüksək nöqtəsində dünyanın 6 aparıcı mərkəzi bankı tərəfindən faiz dərəcələrinin koordinasiyalı şəkildə aşağı salınması və bir neçə mərkəzi bank arasında valyuta mübadiləsi xətlərinin açılması (o cümlədən FED və ABŞ bankı) buna misal ola bilər.

İnkişaf etməkdə olan bazarlara malik olan ölkələr böhran dövründə valyutalarında əhəmiyyətli dalğalanmalar yaşadılar ki, bu da onların valyuta məzənnələrinin tənzimlənməsinə diqqəti artırmasına səbəb oldu. Böhran və böhrandan sonrakı dövrlərdə onlar məzənnənin tənzimlənməsi tədbirlərinin (valyuta intervensiyaları, transsərhəd kapital əməliyyatlarına nəzarət və s.) tətbiqini gücləndirdilər

İnkişaf etməkdə olan bazar iqtisadiyyatları inkişaf etmiş ölkələrə nisbətən daha sürətli dirçəlib, əhəmiyyətli qısamüddətli xarici kapital axını yaşayır. Onlardan bəziləri məhdudlaşdırıcı tədbirlərlə reaksiya verib. Beləliklə, 2009-cu ildə Braziliya ölkə iqtisadiyyatına xarici investisiyalar üçün vergi tətbiq etdi, onun dərəcəsi 2 faizdən 6 faizə qaldırıldı, Tailand əcnəbilər üçün istiqrazlar üzrə gəlirin ödənilməsinə 15 faiz dərəcəsi ilə vergi tətbiq etdi. Beləliklə, bu ölkələr xarici kapital axını hesabına növbəti inflyasiyadan qaçmağa çalışırdılar.

İnkişaf etməkdə olan bazar və inkişaf etməkdə olan iqtisadiyyatlarda da xarici mühitin pisləşməsi və daxili tələbin zəifləməsi səbəbindən artım yavaşlamışdır. İlk siyasət, iqtisadi artımı dəstəkləməklə, fiskal tənzimlənməni davam etdirməklə, leverageni məhdudlaşdırmaqla, daha çox likvidlik təmin etməklə və pul tənzimlənməsini təkmilləşdirməklə inamı bərpa etmək olmalıdır.

Qlobal maliyyə sistemi daxilində ölkələrin qarşılıqlı əlaqəsi ona gətirib çıxarır ki, əgər bir ölkə öz ödəniş öhdəliklərini yerinə yetirmirsə və ya iqtisadi tənəzzülün başlanması ilə əlaqədar ölkənin özəl sektoru ödənişlər həyata keçirə bilmirsə, xarici borc öhdəliklərinin bir hissəsi, bu kreditor ölkənin bank sisteminin itkilərinə səbəb olur. Məsələn, 2011-ci ilin oktyabrında italyan borcalanlarının Fransa banklarına xalis borcunun həcmi 366 milyard ABŞ dolları təşkil etmişdir. Əgər onlar öz öhdəliklərini yerinə yetirə bilməsələr, bu, Fransa iqtisadiyyatının və ölkənin bank sisteminin mövqeyinə mənfi təsir göstərəcək, bu da öz növbəsində Almaniya banklarına borcu olan Fransanın kreditorlarının itkisinə səbəb olacaq və s. Bu maliyyə zəncirvari reaksiyası adlandırıla bilər.

Pul siyasətinin əsas vəzifəsi tam məşğulluq və inflyasiyanın olmaması ilə xarakterizə olunan milli istehsalın həcminə nail olmaqdır. Bu siyasət xərclərin stimullaşdırılması və xərclərin azaldılması dövründə inflyasiyanın məhdudlaşdırılması üçün iqtisadi tənəzzül dövründə pul kütləsinin artırılmasını nəzərdə tutur. Əksər iqtisadçılar qeyri-pul siyasətini güclü stabilizator hesab edirlər ki, onun əsas üstünlüyü çeviklikdir. İqtisadiyyatın davamlı iqtisadi artımının şərti inflyasiyanın sabit aşağı səviyyəsini saxlamaqdır. Bu şəraitin təmin edilməsi hökumətdən müvafiq sabitləşdirmə siyasətini, xüsusən də

mərkəzi bankın monetar alətlərinin köməyi ilə pul bazarındakı vəziyyətə təsir göstərməyi və nəticədə qarşıya qoyulan məqsədlərə nail olmağı tələb edir.

Antiinflyasiya strategiyasının işlənib hazırlanmasında və həyata keçirilməsində həlledici rolu məqbul pul rejiminin və ya başqa sözlə, pul siyasəti strategiyasının seçilməsi oynayır (Kasiyeva F.S., 2016; 289 s.) .

## Nəticə

Məlum olduğu kimi dövlətin makroiqtisadi siyasətinin son məqsədləri iqtisadi inkişafın, tam məşğulluğun qiymətlərin sabitliyinin və tədiyyə balansının tarazlığının təmin olunmasından ibarətdir. Bu məqsədlərə nail olmaq üçün dövlətin sərəncamında pul-kredit siyasəti kimi makroiqtisadi tənzimləyici mexanizm mövcuddur ki, bu da müxtəlif üsullarla reallaşdırılır.Pul-kredit siyasətinin son məqsədlərə nə dərəcədə təsir etməsi bir qədər mübahisəlidir. Lakin mövcud təcrübə onu deməyə əsas verir ki, pul-kredit siyasətinin son məqsədləri qiymət sabitliyinə nail olmaq, orta müddətli perspektivdə manatın dayanıqlığının möhkəmləndirilməsi, onun alıcılıq qabiliyyətinin yüksəldilməsi, xarici valyutaya nisbətən dönərliyinin artırılmasının, iqtisadiyyatın bütün sahələrində kredit resurslarına olan tələbatın ödənilməsinə şərait yaradılması və bank sisteminin möhkəmləndirilməsidir.

Elmi tədqiqatların nəticələri Azərbaycan Respublikası Mərkəzi Bankının praktiki fəaliyyətində istifadə olunur. Xüsusilə, iqtisadiyyatın real sektorunda pul-kredit alətlərinin ümumi daxili məhsulun artımına təsirinin öyrənilməsi üçün üç faktorlu ekonometrik modeldən istifadə olunur ki, bu da iqtisadi artımın təmin edilməsində pul siyasətinin effektivliyini qiymətləndirməyə imkan verir.

## Ədəbiyyat

1. Zahid Fərrux Məmməd “Pul, Kredit, Banklar” Bakı, Azərnəşr, 2016, 320s.
2. Kasiyeva F.S. Pul, Kredit, Banklar (metodik vəsait), Bakı-2016, 289s.
3. Rasim Abasquluyev Maliyyə və kredit, Qanun nəşriyyat- 2018, 256 s.
4. 4.Vyachina IN (2015), Basic tools of credit and monetary policy of the Central Bank // New Science: Strategies and Vectors of Development. №6-1. c.75-78.
5. N.M.Boboshko, C. M. Proyava (2018), financial credit system, Moscow - 240 p.
6. Abramova, Markina, Alexandrova: (2020), Monetary and financial system.Textbook,: Knorus, 446 p.
7. Afanasyev M. (2018). Modernization of state finances of Russia / M. Krivogov // Questions of economics. № 9 C. 103-111.
8. Yepes J.P. (2016). Dollarization and growth: a synthetic control approach to Ecuador and El Salvador’s cases (Doctoral dissertation)
9. Alesina A., Barro R.J. (2017). Dollarization. American Economic Review, 91(2), 381-385.
10. Kindle Edition (2017), Credit appraisal & analysis of financial statements : a hand book for bankers and finance managers, 522 p.
11. Julien Brault, Simone Signore, (2020),Credit Guarantees in the COVID-19 crisis – Relevance and Economic Impact , SUERF Policy Note Issue No 176, June 210 p.
12. Enock Nyorekwa Twinoburyo,Nicholas M. Odhiambo (2018), Journal of Central Monetary Policy and Economic Banking Theory and Practice, p. 123-137
13. http://www.stat.gov.az/menu/6/statistical_yearbooks
14. www.economy.gov.az

**Rəyçi: iqtisad e.f.d V.Mütəllimova**

Göndərilib: 08.02.2022 Qəbul edilib: 11.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/90-94

**Namiq Müslüm oğlu Müslümov**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
namiqmuslum@gmail.com

# MÜASİR BANK SİSTEMİNİN BAŞLICA İNKİŞAF İSTİQAMƏTLƏRİ

**Xülasə**

Son illərdə qlobal bank sistemi informasiya texnologiyalarında sahəsində baş verən inqilabi yeniliklərin və yeni pul-maliyyə münasibətlərinin təsiri ilə əhəmiyyətli dəyişikliyə məruz qalmışdır. Banklar öz müştərilərinə xeyli sayda və günbəgün yenilənən xidmətlər təklif edir və beləliklə, aqressiv şəkildə bəzi bank olmayan sahələrə daxil olur və universal maliyyə institutlarına çevrilirlər. Müasir dünyanın bank işində biz öz fəaliyyətinə görə milli sərhədləri aşaraq beynəlxalq bank sahəsinə daxil olan bank və maliyyə institutları nəzərə çarpmağa başlamışdır. Bu cür bank və kredit təşkilatları beynəlxalq və regional maliyyə və bank institutları ilə birlikdə beynəlxalq bankçılığı təşkil edirlər.

***Açar sözlər:*** *bank, bank və maliyyə xidmətləri, informasiya texnologiyaları, qlobal bankçılıq*

**Namiq Muslum Muslimov**

## The main directions of development of the modern banking system

**Abstract**

In recent years, the global banking system has undergone significant changes under the influence of revolutionary innovations in the field of information technology and new monetary relations. Banks offer their customers a large number of services that are updated on a daily basis, and thus aggressively enter some non-banking sectors and become universal financial institutions. In the banking business of the modern world, we have begun to notice banking and financial institutions that have crossed national borders and entered the field of international banking. Such banks and credit organizations, together with international and regional financial and banking institutions, organize international banking.

***Key words:*** *banking, banking and financial services, information technology, global banking*

## Giriş

Son 25-30 ildə qlobal bank sistemi əhəmiyyətli dəyişikliklərə və inkişafa məruz qalmışdır. Tarixən və ənənəvi olaraq bankların əsas fəaliyyəti əmanətlərin qəbulu və kreditlərin verilməsindən ibarət olub, gəlirlərinin böyük hissəsi də bu istiqamətdən əldə edilmişdir. 1990-cı illərə qədər çoxsaylı bank bazarları yüksək səviyyədə tənzimlənirdi, digər tərəfdən isə rəqabət məhdud idi. Bununla əlaqədar olaraq, Böyük Britaniyada banklara qiymətli kağızlar və investisiyalarla bağlı müxtəlif əməliyyatlar icra etmək qadağan edilmişdi. Digər tərəfdən, kontinental Avropada 1992-ci ilə qədər, məsələn İspaniya və İtaliyada nümayəndəliklərin açılması ilə bağlı məhdudiyyətlər qüvvədə idi və bankların icra edə bildikləri əməliyyat növlərinə görə manelər mövcud idi. Lakin 21-ci əsrin başlanğıcından etibarən bank sisteminin transformasiyası səmərəli və etibarlı bank sektorunun yaradılmasına yönəlməyə doğru getdi.

Özəlləşdirmə prosesi nəticəsində Avropa və başqa yerlərdə dövlət banklarının rolu azaldı və keçmişdə balans hesabatı ilə bağlı mövcud olan müxtəlif məhdudiyyətlər (portfel məhdudiyyətləri kimi tanınır) azaldıldı və ya ləğv edildi, bununla da banklara güzəştlər və maliyyənin idarə edilməsində daha böyük sərbəstliklər verildi.

Bu qlobal tendensiyalar ofis işləri və müştərilərə maliyyə xidmətlərinin yerində çatdırılmasında inqilab edən texnologiyanın inkişafı ilə tamamlandı. Rabitə texnologiyaları sahəsində ümumi təkmilləşdirmələr və aşağı kommunikasiya xərcləri rəqib güclərin rolunu artırdı. Texnologiya maliyyə vasitəçiləri arasında ixtisaslaşmanın sərhədlərini pozmağa davam etdi. Beləliklə, texnoloji bumlar

ümumiyyətlə mövcud maliyyə xidmətlərinin böyüməsini asanlaşdırdı və rəqabət mühitinin səviyyəsini yüksəltdi.

Bu gün banklar tam xidmətlər təklif edən maliyyə müəssisələri hesab olunur və qeyd etmək lazımdır ki, İngiltərədə Berkeley və ABŞ-da J.P.Morgan Chase kimi bəzi banklar öz reklam materiallarındakı bank sözünü siliblər. Müştərilərin maliyyə xidmətlərinə olan tələbatının geniş spektrini ödəmək üçün bankları tam xidmətlər təklif edən maliyyə institutlarına çevirmək motivi maliyyə institutlarının strateji məqsədi olmuşdur.

## Metod

Problemin tədqiq edilməsi prosesində təhlil, analiz-sintez və məntiqi ümumiləşdirmə metodlarından istifadə edilmişdir.

## Analiz

İnkişaf prizmasından baxdıqda banklar uzun müddət ərzində bir neçə standart əməliyyatlarla məşğul olublar: ödənişlərdə vasitəçilik ediblər, əhalidən və hüquqi şəxslərdən əmanətlər yığıblar, kreditləri təsdiqləyibl ər. Kommersiya bankçılığının bugünkü inkişaf səviyyəsində bu ənənəvi fəaliyyətlər yeniləri ilə tamamlanır. Bank sahəsində bu gün baş verən dəyişikliklər son dərəcə əhəmiyyətlidir. Bankların mövcud çoxsaylı funksiyalarına bir sıra yeniləri əlavə olunur. Maliyyə və bank axınlarının qloballaşması bankların yeni idarəetmə şərtlərinə uyğunlaşması hesabına müasir bank konsepsiyalarının reallaşmasına gətirib çıxarmışdır. Bankların ənənəvi rolu nəzərəçarpacaq dərəcədə dəyişmişdir ki, onlar hazırda standart əməliyyatlarla yanaşı, qiymətli kağızlarla əməliyyatlar, zəmanətlər, ipoteka xidmətləri və s. kimi bir sıra qeyri-ənənəvi bank əməliyyatlarını da həyata keçirirlər.

Bu gün kommersiya banklarının ən mühüm əlavə fəaliyyəti maliyyə bazarlarındakı fəaliyyətidir. Kommersiya bankları istiqrazların və digər qiymətli kağızların emissiyası vasitəsilə də vəsait əldə edirlər. Həmçinin, yerləşdirmə siyasətində standart kredit yerləşdirmələri ilə yanaşı, kommersiya bankları getdikcə daha çox müxtəlif qiymətli kağızların alışında sərbəst vəsaitlər yerləşdirirlər.

Banklar öz müştərilərinə xeyli sayda və günbəgün yenilənən xidmətlər təklif edir və beləliklə, aqressiv şəkildə bəzi bank olmayan sahələrə daxil olur və universal maliyyə institutlarına çevrilirlər. Müasir dünyanın bank işində biz öz fəaliyyətinə və fəaliyyətlərində üstünlük təşkil etmələrinə görə milli sərhədləri aşaraq beynəlxalq bank sahəsinə daxil olan bank və maliyyə institutları nəzərə çarmağa başlamışdır.

Bunlar öz mahiyyətinə görə beynəlxalq və ya regional bank və maliyyə institutları olmamasına, fəaliyyətlərinə görə milli banklar, yəni milli iqtisadiyyatların bankları kimi qeydiyyatdan keçmələrinə baxmayaraq, milli banklardan daha çoxuna iddialıdırlar, çünki onların əməliyyatları getdikcə daha çox beynəlxalq valyuta, maliyyə və kredit münasibətlərində və tendensiyalarında iştirak edir. Bu bank və kredit təşkilatları beynəlxalq və regional maliyyə və bank institutları ilə birlikdə beynəlxalq bankçılığı təşkil edirlər.

Bu gün isə hazırkı mühəndislik və reinjiniring, habelə texnoloji inkişafın gətirib çıxardığı planetar bankçılıq haqqında danışa bilərik. Beynəlxalq bankçılıq və ya bəzilərinin adlandırdığı kimi planetar bankçılıq 20-ci əsrin 90-cı illərində inkişaf etməyə başladı. Qısa müddət ərzində beynəlxalq bank sistemində bir çox genişmiqyaslı dəyişikliklər baş verdi ki, onlar təkcə bank işi baxımından deyil, həm də ümumi monetar-maliyyə-bank sistemi baxımından mahiyyətcə inqilabi xarakter daşıyırdı. Bu dəyişikliklərin elementləri aşağıdakılardır: şiddətli rəqabət şəraitinin dəyişməsi və maliyyə bazarında qalmaq uğrunda mübarizə; bank məhsullarını seqmentləşdirilmiş bank prosesinin istehsalı ilə əvəz edən elektron və texnoloji inqilab; və öz seqmentləşdirilmiş bank proseslərini qloballaşan dövlətlərüstü bazarda yerləşdirən yeni planetar bankların yaradılması.

Bankların səmərəli fəaliyyəti onların çevikliyindən, yəni digər maliyyə institutları ilə müqayisədə rəqabət üstünlüyü təmin edəcək dəyişikliklərə uyğunlaşmaq qabiliyyətindən asılıdır. Ənənəvi kommersiya banklarının müasir universal institutlara çevrilməsində ən mühüm fundamental amillərdən biri rəqabətdir. Rəqabət qlobal iqtisadiyyatda artan tendensiyaların hərəkətverici amilidir. Artan rəqabət bankları adekvat məqbul gəlir əldə etmək üçün riskli fəaliyyətlərə məcbur edir. Bankların rəqabətlə

üzləşməsi üçün onlar yeni mühitə uyğunlaşmalı, həmçinin yeni məhsul/ xidmətlər tapmalıdırlar. Bütün bunlar müxtəlif sahələrdə rəqabətin artmasına təsir göstərir. Son illərdə depozitlər uğrunda rəqabət, kreditlər uğrunda rəqabət, ödəniş xidmətləri və digər bank xidmətləri üzrə rəqabət getdikcə yüksəlməkdədir. Xüsusilə, elektron ödəniş sistemlərinin yaranması ilə bank qurumları arasında rəqabət və ödəniş xidmətlərində rəqabət artmışdır.

İnformasiya texnologiyaları son illərdə bank əməliyyatlarına böyük təsir göstərmişdir. Bank əməliyyatlarında getdikcə təkmilləşən texnologiyadan istifadə həm milli, həm də beynəlxalq səviyyədə inteqrasiya meyllərinə səbəb olmuşdur.

Müasir informasiya-kommunikasiya texnologiyaları banklar arasında texnoloji inqilaba səbəb olmuşdur. Qurğuların köməyi ilə banklar öz müştəriləri ilə interaktiv əlaqə yaradıb və bununla da onların əməliyyatlarının xərclərini azaldıblar. Elektron bankçılıq, təbii və ya qanuni bank xidmətləri istifadəçilərinə internet də daxil olmaqla ictimai və ya özəl şəbəkə vasitəsilə onlardan istifadə etmək, konkret əməliyyatlar etmək və ya maliyyə məhsulları və xidmətləri haqqında məlumat əldə etmək imkanı verən sistemləri əhatə edir. Kağız əsaslı ödəniş alətləri getdikcə azaldılır və bu ənənəvi ödəniş alətlərinin analoqu kimi, elektron ödəniş üçün yeni alətlər işlənib hazırlanmışdır ki, bunlar arasında ən çox istifadə olunanlar elektron nağd pul, elektron çek və ödəniş kartlarıdır.

Elektron bankçılıq bank əməliyyatlarını yerinə yetirmək üçün bir vasitə və ya bank məhsul və xidmətlərini təqdim etmək üsulu deməkdir. Bazel Bank Nəzarəti Komitəsi (BCBS) elektron bankçılıq terminini "bank xidmətləri və məhsullarının yeni üsulla, elektron kanallar vasitəsilə paylanması" kimi müəyyən edir (Basle Committe on Banking Supervision, http://www.bis.org/ publ/bcbs35.pdf, 1998: s. 3). Bu bank xidmətləri və məhsullarına bank depozitləri və kreditləri, mühasibat uçotunun idarə edilməsi, həmçinin elektron ödəniş üçün digər məhsul və xidmətlərin (məsələn, e-cash) təqdim edilməsi daxildir.

Elektron bankçılığın təklif etdiyi xidmətlərdən istifadəçilər fərdi kompüter (PC), fərdi rəqəmsal köməkçi (PDA), bankomat (ATM) və s. kimi müasir elektron cihazlardan istifadə etməklə yararlana bilirlər.

Beləliklə, maliyyə xidmətləri sənayesində ən çox yayılmış tendensiya hazırda rəqəmsal, xüsusən də mobil və onlayn bankçılığa keçiddir. İndiki misli görünməmiş rahatlıq və sürət dövründə istehlakçılar əməliyyatlarını idarə etmək üçün fiziki bank filialına getmək məcburiyyətində qalmırlar. Bu, xüsusən də işçi qüvvəsində dominant oyunçular (və ən çox qazananlar) olmağa başlayan Z nəsillərinin üzvlərinə aiddir. Bəhs edilən rəqəmsal transformasiya texnoloji startaplar arasında rəqabətin artmasına, həmçinin kiçik bankların və startapların konsolidasiyasına səbəb olmaqdadır.

Müasir bank xidmətləri içində mobil bankçılıq istehlakçılar üçün ən mühüm tələbatlardan biridir. Business Insider Intelligence-in 2018-ci ildə apardığı "Mobile Banking Competitive Edge Study"də respondentlərin 89%-i mobil bank xidmətindən istifadə etdiyini bildimişdir ki,bu göstərici 2017-ci ildə 83% idi (http://www.businessinsider.com/banking-industry-trends%3famp, 2021).

Hazırda bankların müştəriləri cəlb etmək və saxlamaq üçün sadəcə mobil proqrama malik olması kifayət etmir. Kartlara müvəqqəti saxlama imkanı, təkrarlanan ödənişlərə baxmaq və ya hesaba daxil olmaq üçün barmaq izini skan etmək kimi əlavə alətlər və funksiyalar getdikcə daha çox tələb olunur. Bankların özləri üçün kritik olan məqam ondan ibarətdir ki, mobil bankçılıq istifadəçilərinin 64%-i hesab açmadan əvvəl bankın mobil imkanlarını araşdıracaqlarını, 61%-i isə bankları zəif mobil bankçılıq təcrübəsi təklif edərsə, bankları dəyişəcəklərini bildiriblər (http:// www.businessinsider.com/banking-industry-trends%3famp, 2021).

Bank sistemində müasir dövrün digər tendensiyası investisiya bankçılığı ilə texnologiyanın qarşılıqlı əlaqəsindən meydana çıxır. İnvestisiya bankçılığı bir şəxs və ya şirkətin fərdlərə, müəssisələrə və hətta hökumətlərə pullarını necə və hara yatırmaq barədə məsləhət verdiyi maliyyə xidməti növüdür. Onilliklər ərzində bu, qarşılıqlı faydalı əlaqələrə səbəb olan üz-üzə proses olmuşdur.Lakin hazırda robot məsləhətçilərinin artması ilə süni intellekt (AI) və robot proseslərinin avtomatlaşdırılması dünyada geniş yayılmağa başlamışdır. Proqnozlaşdırılan analitika investorlara real vaxtda daha ağıllı, daha sərfəli qərarlar qəbul edərkən xərclərə qənaət etməyə kömək edə bilir. Nəhayət, süni intellekt investisiya

bankirinin fərziyyəsini təsdiqləməyə kömək edə və gələcək qərarların daha əhatəli olmasına səbəb ola bilər.

Bütün dünyada banklar Bank və Maliyyə Xidmətləri (BMX) sənayesini yenidən formalaşdıran bəzi əsas tendensiyalara nəzər salmaq gələcəkdə aktual qalmaq üçün maliyyə institutları tərəfindən həyata keçirilən dəyişiklikləri başa düşməyi asanlaşdırır. Bu tendensiyalar arasında davam edən rəqəmsal transformasiya, FinTech şirkətlərinin meydana çıxması, Süni İntellektin (AI) və robot texnikasının artan rolu və pul anlayışının yenidən nəzərdən keçirilməsi daxildir. Qlobal sənaye, əməliyyat səmərəliliyini artırmaq, bazara çıxış sürətini artırmaq və üstün müştəri təcrübəsi təqdim etmək üçün rəqəmsallaşmaya və yeni və inkişaf etməkdə olan texnologiyaların qəbuluna davamlı və aqressiv diqqətin şahidi olur.

Bir çox bank ya şirkət daxilindəki texnologiyalardan istifadə etməklə, ya da FinTech şirkətləri ilə əməkdaşlıq edərək rəqəmsal texnologiyanın təqdim etdiyi imkanlardan istifadə etməyə çalışır. Bu gün bank-FinTech tərəfdaşlığı getdikcə normaya çevrilir, marketinq, administrasiya, kredit xidməti və ya banklara texnoloji imkanlı bank məhsulları təklif etməyə şərait yaradan digər xidmətlər təqdim edir. Banklar həmçinin bank-FinTech tərəfdaşlığının bəzi digər üstünlüklərini, o cümlədən aktivlərə və müştərilərə çıxışı əldə edilər. Nəticədə, bu əməkdaşlıqlar maliyyə xidmətləri mənzərəsini yenidən formalaşdırmağa başlayır (http://www.bankdirector.com/issues/strategy/why-bank-fintech-partnerships-are-here-stay/, 2017).

Müasir dövrün başlıca meyillərindən biri də son on illikdə pul anlayışının yenidən nəzərdən keçirilməsinə gətirib çıxaran proseslərin cəryan etməsidir. Blokçeyn kimi texnologiyalar artıq BMX sənayesinin təklif etdiyi ənənəvi iqtisadi dəyəri şübhə altına alan səssiz bir inqilabdan xəbər verir. Blockçeyn peer-to-peer kreditləşdirmə, ağıllı müqavilələr və rəqəmsal ödənişlər ilə ənənəvi biznes modellərinin əsaslarını sarsıdır, vasitəçiləri aradan qaldırır və əsas prosesləri sürətləndirir. Blokçeynin BMX sənayesi üçün illik əməliyyat xərclərinə 20 milyard ABŞ dolları qənaət edəcəyi gözlənilir ki, bu da artan sayda bankları texnologiyanı kommersiya istehsalında tətbiq etməyə sövq etməkdədir (http://www.reuters.com/article/idUS191361512320160229, 2016). Blokçeynə əlavə olaraq, Bitcoin, Ethereum və Ripple kimi kriptovalyutalar da fiziki nağd pula olan ehtiyacı şübhə altına alaraq yavaş-yavaş cazibə qazanmaqdadır.

## Nəticə

Texnologiyadan artan istifadənin banklar üçün irəliyə doğru yol olduğu aydın olsa da, icra ilə bağlı bir sıra qeyri-müəyyənliklər qalmaqdadır. Ən effektiv olmaq üçün banklar və maliyyə institutları özlərini maliyyə xidmətləri sənayesində çevik texnologiya şirkətləri kimi yenidən formalaşdırmalıdırlar. Bu o deməkdir ki, Beynəlxalq Maliyyə Xidmətləri şirkətləri öz qeyri-əsas əməliyyatlarını dayandırmalı, yalnız müştərilər üçün əsl fərqi təmin edən biznesləri saxlamalıdırlar. Banklar həmçinin müştərilərin seçimləri, demoqrafik vəziyyət və həyat tərzi dəyişdikcə öz başlıca əməliyyatlarını dəstəkləyən əsasları araşdırmalı olacaqlar.

Beləliklə, qlobal bank və maliyyə xidmətləri sənayesində son illərin başlıca inkişaf meyilləri və yenilikləri ümumiləşdirərək, aşağıdakı qənaətlərə gəlmək mümkündür:

- Bank və maliyyə xidmətləri sənayesi texnologiya tərəfindən getdikcə daha çox idarə olunacaq gələcəyə hazırlaşmaq üçün başlıca diqqətini innovasiyaya yönəltməlidir.
- Bu yeniliklərə təkan verən əsas tendensiyalar arasında davam edən rəqəmsal transformasiya, FinTech ilə əməkdaşlıq və süni intellekt və robot texnikasının artan rolu daxildir.
- Müştəri seçimləri, demoqrafik göstəricilər və həyat tərzi dəyişdikcə banklar və maliyyə institutları özlərini çevik texnologiya şirkətləri kimi yenidən formalaşdırmalıdırlar.

## Ədəbiyyat

1. Atakişiyev M.C., Nurəliyeva R.N., Abbasova N.H. İnvestisiya fəaliyyətinin təşkili, Bakı, 2012. 251 səh.
2. Bağırov D.A., M.X. Həsənli "Maliyyə" dərslik Bakı, 2011. 168 səh.
3. Brigham Yu., Houston J. Financial management. St. Petersburg: Piter, 2007. - 544 p.
4. Cəfərli H.A. İqtisadi təhlil. Dərslik. Bakı. «Elm və təhsil», 2009.-560 s.

5. Galanov V.A. (2012). Stocks and bods market. Textbook. Moscow: INFRA-M-378 s
6. Həsənov H. "Antiböhranlı idarəetmə". Dərs vəsaiti. Bakı-2013. 168 səh.
7. Həsənov H. "Müəssisənin iqtisaidyyatı". Dərs vəsaiti. Bakı-2013. 900 səh.
8. Xanhüseyn Kazımlı, İbrahim Quliyev. İqtisadi risklərin qiymətləndirilməsi və idarə edilməsi. Dərs vəsaiti. Baki: "İqtisad Universiteti" – 2011. - 187 səh.
9. Kazımov R.N., Namazova C.B. Praktiki audit. Dərslik, – Bakı, CBS, 2012. – 246 s.
10. Mahmudov I.M., Zeynalov T.Ş., İsmayılov N.M. İqtisadi təhlil. Dərslik. – Bakı, İqtisad Universiteti. 2010– 796 s.
11. Müslümov S.Y., Kazımov R.N. Maliyyə təhlili. Dərslik. Bakı, CBS, 2011– 312s.
12. Namazova C.B. İnvestisiya qoyuluşlarının inkişaf perspektivləri. Monoqrafiya. – Bakı. CBS. 2008-222 s.
13. Basle Committe on Banking Supervision. (1998), http://www.bis.org/publ/bcbs35.pdf, 28 səh. (02.12.2021).
14. Beattie, A. The Evolution of Banking Over Time, 2021, https://www.investopedia. com/articles/ 07/banking.asp (04.12.2021).
15. Meola, A. The digital trends disrupting the banking industry in 2021. 2021,
16. http://www.businessinsider.com/banking-industry-trends%3famp (30.11.2021).
17. Elliott, D. Blockchain is a zero-sum game for investiment banks, 2016,
18. http://www.reuters.com/article/idUS191361512320160229 (29.11.2021)
19. Holzel, K. Why bank-fintech partnerships are here to stay, 2017,
20. http://www.bankdirector.com/issues/strategy/why-bank-fintech-partnerships-are-here-stay/ (01.12.2021).

**Rəyçi: iqtisad e.d. M.Bağırov**

Göndərilib: 14.02.2022 Qəbul edilib: 16.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/95-100

**Nərmin Əbülfəz qızı Mehtiyeva**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
ms.idhem@mail.ru

# PANDEMİYA DÖVRÜNDƏ AZƏRBAYCANDA KOMMERSİYA BANKLARININ FƏALİYYƏTİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Xülasə**

Kommersiya banklarının fəaliyyəti daim dəyişən makroiqtisadi şəraitdə həyata keçirilir, bunun nəticəsində kredit təşkilatlarının özlərinin dəyəri və funksiyaları dəyişdirilir. Hazırkı iqtisadi-maliyyə böhranı şəraitində kommersiya bankları ölkə iqtisadiyyatının sabitləşdirilməsində və makroiqtisadi göstəricilərin müvafiq səviyyədə saxlanılmasının təmin edilməsində əsas rol oynamalı, iqtisadi transformasiyanın hərəkətverici mexanizminə çevrilməlidir. Bu hallar və bankların pul münasibətlərində yeri və bu maliyyə institutlarının mahiyyətinin müəyyənləşdirilməsi ilə bağlı çoxsaylı müxtəlif fikirlərin mövcudluğu müasir kommersiya banklarının fəaliyyətinin makromühiti ilə bağlı daha ətraflı öyrənilməsini və bankların əhəmiyyətinin yenidən nəzərdən keçirilməsini zəruri edir.
***Açar sözlər:*** *bank sektoru, kommersiya bankları, kredit, pandemiya*

**Narmin Abulfaz Mehtiyeva**

## Evaluation of the activity of commercial banks in azerbaijan during the pandemy period

**Abstract**

The activities of commercial banks are carried out in a constantly changing macroeconomic environment, as a result of which the value and functions of credit institutions themselves change. In the current economic and financial crisis, commercial banks must play a key role in stabilizing the country's economy and ensuring that macroeconomic indicators are maintained at an appropriate level, and become a driving force for economic transformation. These circumstances and the existence of numerous different views on the role of banks in monetary relations and the nature of these financial institutions make it necessary to study in more detail the macroeconomic environment of modern commercial banks and to reconsider the importance of banks.
***Key words:*** *banking sector, commercial banks, credit, pandemic*

## Giriş

Azərbaycanda bank sistemində baş verən dəyişikliklərin müxtəlifliyi və mürəkkəbliyi, təşkilatda, xidmət formalarında və bank idarəçiliyində çoxlu yeniliklərin ortaya çıxması, inkişaf etdirilmə ehtiyacı ilə müəyyən edilir. Maliyyə bazarının qüsurlu institusional infrastrukturu və hazırda ölkəmizdə ixtisaslaşmış təşkilatların (investisiya, ipoteka və digər banklar) fəaliyyət göstərməsi üçün şəraitin olmaması səbəbindən geniş əməliyyatları həyata keçirən kommersiya banklarıdır. Bu banklar ölkənin ayrı-ayrı sektorların inkişafı məsələsini həll edir. Bu, bankların inkişafı, qaynaqların tənzimlənməsi, kapital qoyuluşunun yeni formalarına yiyələnmək və bazarda uyğun davranış prinsipləri hazırlamaq üçün əsas proqramlar hazırlamasını tələb edir. Kommersiya bankları fəaliyyətlərini şaxələndirməklə nəinki maliyyə bazarının ehtiyaclarına fəal cavab verməyə, həm də əməliyyatlarının risk və gəlirliliyinin optimal nisbətini tapmağa, rəqabət qabiliyyətini və etibarlılığını artırmağa çalışırlar.

Daxili iqtisadiyyatın inkişaf etmiş bazar münasibətlərinə keçməsi şəraitində kommersiya bankının fəaliyyət göstərməsinin məqsədi, ən böyük qazanc əldə etmək istəyidir. Hal-hazırda, pandemiya səbəbindən bankların inflyasiya gəlirlərinin azalması, dövlət qiymətli kağızlarının və digər maliyyə alətlərinin gəlirliliyinin azalması və Mərkəzi Bankın kommersiya banklarından kredit təşkilatlarına

The novelty of the Convention was that it was the first time that individuals could apply to an international court. Prior to the adoption of the Convention, the judicial protection of the rights of individuals was the exclusive right of the States concerned (Shelton, 2000: 77).

Following the entry into force of the Convention, the protection of these rights was made possible by a specialized international court in accordance with its provisions. That is why the Convention can be called an unprecedented international agreement. Former European Court of Justice judge Fitzmores called the right of a person to appeal to an international tribunal from his government a “revolutionary concept (Thomas, 2007: 18)”.

Thus, the adoption of the European Convention on Human Rights was an important step in making the individual a subject of abuse of international law. As already mentioned, the international justice mechanism established under the Convention is based on compromise.

The essence of the compromise was that once a State Party has ratified the Convention, its jurisdiction does not automatically have the right to apply to the European Commission.

This required a special declaration of recognition of such right by the State concerned (as amended before the entry into force of Protocol 11 to Article 25 of the Convention). Of the states that ratified the Convention in 1950, the Netherlands in 1960, the United Kingdom in 1966, Italy in 1973, and France in 1981 recognized the right to individual appeal. The declaration undertakes not to impede the effective exercise of this right in any way (Tomkins, 2015: 77).

We have already noted that an important oversight mechanism has been established under the Convention - the European Court of Human Rights. From the historical point of view, the activity of the Court can be divided into several stages (Tomkins, 2015: 128):

The first stage can be called the period of formation of the Court. First of all, it should be noted that the Court came into force 9 years after the adoption of the Convention and 6 years after its entry into force, i.e. in 1959.

This is mainly due to the fact that ratification of the Convention by a State Party did not automatically mean recognition of the Court's jurisdiction. In this case, a special state statement was required. The first stage covers the middle of 1959-1970 (Tomkins, 2015: 70).

In 1959, the Court adopted its own rules of procedure and considered the first case in 1960-1961 (Lawless v. Ireland). Subsequently, the Court heard ten more cases. (“Wemhoff v. Germany”, “Nuemeister v. Austria”, “Stögmüller v. Austria”, “Matrnetter v. Austria”, etc.).

During this period, the legal position of the ship itself was determined. Already in 1962, in the second case (“De Becker v. Belgium”), the Court found that he did not control the national legislation of the states. Thus, the first stage was the stage of formation of the Court.

The second stage covers the mid-70s and late 80s. This stage is the period when the number of cases considered by the Court is increasing. During this period, the number of cases considered by the Court reached 200 (12). Already in the early stages of the second stage, it became clear that in the case law, the main place is occupied by individual complaints.

During this period, there was great sympathy for the Court among the European community, and the Court's rating rose rapidly. This stage can be called the period of improvement of the Court.

The third stage covers the end of 1990-1998. The main feature of this stage is that the number of cases considered by the members of the Council of Europe and in this connection by the Court has increased rapidly. As a result of the collapse of the USSR, 17 new members were admitted to the Council. Between 1990 and 1998, the Court issued about 700 rulings.

One third of the cases considered during this period fell to Italy, followed by France - 79 cases, Great Britain - 59, Austria - 54, Greece - 30, Turkey - 20, etc. This period is not only marked by the rapid increase in cases considered by the Court.

Protocol No. 9 to the Convention, adopted in 1990, which provides for the individual applicant to become a full participant in the proceedings, entered into force in 1994 (12).

The protocol provided for the individual to apply directly to the Court and to be personally represented in the Court. This, in turn, led to a change in the rules of procedure, which resulted in two regulations.

Regulation A applied to States which had not ratified Protocol No. 9, and Regulation B applied to States which had not ratified that Protocol. Regulation B also provided for the establishment of three-judge committees to decide whether a complaint had been accepted. However, during this period, the cases considered by the Court passed through the European Commission.

## Conclusion

According to the results of the study, it should be noted that among the international mechanisms for the protection of human rights, the mechanisms operating in the UN system have a special place. These mechanisms are essentially universal contract mechanisms.

These mechanisms, which are important international oversight bodies in the field of human rights, are based on monitoring (ie, in a sense, monitoring this process) the implementation of the relevant international treaty at the national level. These mechanisms can also be called monitoring bodies because they perform monitoring functions. In addition, a number of mechanisms (for example, the Human Rights Committee, the Committee against Torture, the Committee for the Elimination of Racial Discrimination, etc.) have the authority to consider individual and interstate complaints of human rights violations.

## References

1. Brownlie I, Principles of Public International Law (7th edn, Oxford University Press, 2008) ISBN 0-19-926071-0, 400 p.
2. Dominique C., 10e édition, 2009 ISBN 978-2-233-00561-8, 344 p.
3. Əliyev Z. Avropa İnsan Hüquqları Məhkəməsi. Bakı, 2012, 232 s.
4. Kerbrat Y.,"Droit international public" (10th ed., Paris, Dalloz, 2010) ISBN 978-2-247-0893-5,400 p.
5. Lawson, E.; Encyclopedia of human rights (2nd ed.) 2019, 455 p.
6. Osmanczyk, E. The encyclopedia of the United Nations and international relations. Taylor & Francis, 2018, 398 p.
7. Rafael Domingo Osle, The New Global Law (Cambridge University Press 2010), 299 p.
8. Shaw M. N., International Law (5th ed Cambridge University Press 2003), 459 p.
9. Shelton D. Remedies in International Human Rights Law. Oxford, 2000, 388 p.
10. Thomas P. Fredom from Poverty as a Human Right. Oxford university press, 2007, 406 p.
11. Tomkins A. The Committee of Ministers: Its Roles under the European Convention on Human Rights. European Human Rights Law Review, 2015, 262 p.
12. http://lawlibrary.info/az/books/GIZ2012-Az-Avropa-Insan-Huquqlari-M%C9%99hk%C9%99m%C9%99si.pdf - Avropa İnsan Hüquqları Məhkəməsi 2022.

**Rəyçi: h.f.d. E.Mirzəyeva**

Göndərilib: 21.02.2022 Qəbul edilib: 18.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/138-142

**Nicat Zaməddin oğlu İsmayılov**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistratura
nicat_ismayilov.98@mail.ru

# İSTEHLAK KREDİTİNİN MAHİYYƏTİ VƏ XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Hər bir ölkədə kredit ehtiyatlarının böyük bir hissəsinin formalaşmasında kommersiya bankları mühim rola malikdir. Kommersiya bankları eyni zamanda da müştərilərə müxtəlif növ maliyyə-kredit xidmətlərini təklif edir. Kommersiya bankları eyni zamanda da müxtəlif funksiyaları yerinə yetirə bilirlər. Belə ki, bəzi müəlliflərin fikrincə, kommersiya bankları əmanət, sığorta, köçürmə-hesablaşma, anderrayter, kredit, investisiya planlaşdırması, broker, kredit pulların emissiyası kimi müxtəlif funksiyaları həyata keçirir. Tədqiqat işinin əsas istehlak kreditinin mahiyyəti və əsas xarakterik xüsusiyyətlərinin nəzəri-metodoloji əsaslarını tədqiq olunmasıdır.

***Açar sözlər:*** *kredit, istehlak krediti, problemli kreditlər, kommersiya bankları*

**Nijat Zamaddin Ismayilov**

## Significance and characteristics of consumer credit

**Abstract**

Commercial banks play an important role in the formation of a large part of credit reserves in each country. Commercial banks also offer a variety of financial and credit services to customers. Commercial banks can also perform various functions. Thus, according to some authors, commercial banks perform various functions such as savings, insurance, transfer-settlement, underwriting, credit, investment planning, brokerage, issuance of loan money. The main research work is to study the theoretical and methodological basis of the essence and main characteristics of consumer credit.

***Key words:*** *credit, consumer credit, problem loans, commercial banks*

## Giriş

Kreditin mahiyyəti bu anlayışın ifadə etdiyi hərfi məna ilə çox uyğundur. Belə ki, kredit latın dilindən tərcümədə etimad etmə, inanma mənalarını verir. Başqa sözlə desək, kredit inam əsasında pul vəsaitinin bir nəfərdən çıxaraq digərinə hərəkət etməsi prosesidir. Lakin burada diqqət edilməsi lazım olan əsas nüans kreditin müəyyən faiz müqabilində və qaytarılmaq şərtilə verilməsidir. Kredit həm pul formasında, həm də hansısa əmtəənin ödəniş vasitəsi kimi çıxış edə bilər. İstənilən halda kredit satın alınmış məhsulun dəyərinin dərhal ödənməsini deyil, onun müəyyən müddət ərzində hissə-hissə ödənməsini təmin edir (Cavadov A.M., 2012: s.25).

Kredit anlayışı iqtisadiyyatın mühim tərkib hissəsi və əsas kateqoriyasıdır. O, istehsal müəssisələrinin elementlərindən biri olmaqla, əmtəələrin, xidmətlərin və kapitalların hərəkətində əsas rol oynayır. Kredit həmçinin mənfəət, qiymət, pul, valyuta kursu, tədiyyə balansı kimi iqtisadi kateqoriyalarla və bazar iqtisadiyyatının iqtisadi qanunları ilə qarşılıqlı surətdə bağlıdır (Abbasov Ə., Həmişəyeva Ş., Məmmədov Z., Rzayev R. 2013: s. 67).

Kredit əməliyyatlarının iki tərəfi- krediti verən və alan tərəfləri olur. Kredit verən ödəmə vədi alaraq pul verən tərəf, kredit alan isə aldığı krediti ödəyəcəyinə vəd verən tərəfdir.

Bank məhsulları əsasən xidmətlərdir. Burada müştəri məmnuniyyəti əmlaka sahib olmaqdan qat-qat üstündür. Tək bir xidmət bəzən fərqli xüsusiyyətlərə malik olduğu üçün müxtəlif bazar seqmentlərinə müraciət edə bilər. Məsələn, kredit kartları bəzi sosial-iqtisadi qruplar tərəfindən hesabların ödənilməsi üsulu kimi qəbul edilir, digərləri isə (aşağı gəlirlilər) bunu ödənişi gecikdirmək və ya kredit əldə etmək üsulu kimi qəbul edirlər (Catalca, 2010: 18-19).

## Analiz

Müştərilərin sayı artdıqca banklar innovasiyalar vasitəsilə əlavə dəyər yaratmaq üçün müsbət sosial və ya ətraf mühitə təsir göstərən məhsul və xidmətlər axtarırlar.

Bankların təqdim etdiyi əsas xidmətlərdən biri də kreditlərdir. Kredit təminat və etimad kimi çox ciddi faktorlara söykənən əməliyyatdır. Məhz kredit əməliyyatı vasitəsilə pul vəsaitlərinin bazara çıxması, eləcə də hər hansısa bir əmtəənin ən faydalı şəkildə realizə olunmasına şərait yaradır. Pul likvid xarakterə malik olduğundan borcverən indi almağı olduğu əmtəəni gələcəkdə realizə edə bilər, borcalan isə gələcəkdə almasını planlaşdırdığı əmtəəni kredit vasitəsilə dərhal satın ala bilər. Bu qeyd olunanlar onu deməyə imkan verir ki, kredit bir növ insanlarının tələbatlarının ödənməsində əsas vasitə kimi çıxış edir (Əliyev M.F., 2014, s. 34).

Kreditin ən geniş yayılmış forması kimi bank kreditləri çıxış edir. Bank kreditlərində kredit müqaviləsinin tərəfləri kimi bank və borc alan çıxış edir. Bankın kredit verməsində əsas məqsədi müəyyən faiz qazanmaq və özünün mənfəətini təmin etməkdir. Borcalan isə cari dövrdə öz tələbatını təmin etmək üçün müəyyən faiz itirməyə razı olur.

İstehlak kreditləri günümüzdə ən aktual olan kreditin təzahür formalarından biridir. Bəzi hallarda istehlak kreditləri ilə bank kreditləri anlayışları eyniləşdirilir və yaxud da qarışdırılır. Lakin bu iki anlayış arasında kəskin fərqlər mövcuddur. Belə ki, istehlak kreditləri əhalinin ayrı-ayrı təbəqələrinin, fiziki və hüquqi şəxslərin zəruri ehtiyaclarını ödəmək məqsədilə verilən kredit növüdür. Bu forma istər pul formasında, istərsə də hər hansısa bir əmtəənin satın alınmasında iştirak edə bilər. Bu səbəbdən də istehlak kreditlərinin subyekti kimi yalnız banklar deyil, eyni zamanda da bank olmayan kredit təşkilatları və alış-veriş əməliyyatlarını həyata keçirən hüquqi şəxslər də çıxış edə bilər.

Banklar kreditlə bağlı olan məhsullarının bir qismini kredit kartlar vasitəsilə əhaliyə təqdim edirlər. Deməli onda bankın verdiyi kredit bank xidmətinə aid edilirsə, kredit kartlar isə bank məhsulu hesab olunur.

Kredit kartlarının inkişafı araşdırıldığında dünyada ilk kredit kartının 1894-cü ildə ABŞ-da Hot Credit Teller şirkəti tərəfindən istifadəyə verildiyi görülür. 1930-1940-cı illər arasında ABŞ-da bir çox müəssisə, xüsusilə Sears, Macy's və Goldwaters kimi böyük mağazalar müştərilərinə kredit kartı funksiyaları olan kartlar buraxmağa başladılar. İkinci Dünya Müharibəsindən sonra 1950-ci illərdə Diners Club, American Express və Carte Bianche adlı müəssisələr imza ilə debet və ön tərəfində qabartma hərfləri olan slip çəkmə üsuluna əsaslanan ilk müasir kredit kartlarını bazara təqdim etdilər. Daha sonra, 1960-cı ildən etibarən Bank of America tərəfindən buraxılan və VISA adlı kredit kartı ABŞ bazarında üstünlük təşkil etməyə başladı. Bu tarixdən etibarən kredit kartlarının bu ölkənin hüdudlarından kənarda istifadəsi 1966-cı ildə İngiltərədə Barclay's Bank tərəfindən Avropada ilk kredit kartının buraxılmasına səbəb oldu (Borowsky, 1994: 60).

İlk illərdə kredit kartları haqqında heç bir məlumatın olmamasından yaranan problemlər və narahatlıqlar var idi. Ayrı-ayrı şəxslər kredit kartı ilə ödəniş etməyin onlarda pulun olmadığı təəssüratı yaradacağından qorxurdular. Bundan əlavə, kredit kartı tətbiqinin vacib hissələrindən biri olan məlumatların işlənməsinin o dövrlərdə kifayət qədər səviyyədə olmaması kredit kartlarının inkişafını ilk vaxtlarda çətinləşdirirdi. Ancaq 1980-ci illərin son dövründə kompüterləşmə və istehlak cəmiyyətinin xüsusiyyətlərinin artması ilə Türkiyədə kredit kartı tətbiqi sürət qazandı.

Kart sahibi tacirdən əmtəə alır, tacir müəyyən gün pulu bankdan alır və bank bu məbləği müştərinin adına açılmış cari hesaba son ödəniş tarixinin dəyəri ilə, hansını müəyyən edir və hansını müştəriyə, yəni kart sahibinə bildirəcək. Bu son ödəniş günü kart sahibinin bu xərci faizsiz ödəyə biləcəyi son günə aiddir. Kart sahibi xərclərin bütün məbləğini və ya ödəniləcək minimum məbləği ödəməklə müəyyən faiz müqabilində öz xərclərini kreditləşdirə bilər (Teoman, 1996; 51).

Debet kartları bankomatlarda və alış-verişdə istifadə olunan kartlardır. Ümumiyyətlə, bütün banklar öz əmanətçilərinə ATM kartları adı altında və kredit kartı adı ilə plastik kartları təklif edirlər. Ən çox yayılmış kredit kartları Visa, Mastecard və American Express-dir.

*Viza klassik kartlar.* Bunlar bankların həyata keçirdiyi siyasətlərə əsasən ölkə daxilində və xaricdə istifadə edilən, müxtəlif bankomatlardan və ya bank filiallarından alış-veriş və nağd pul çıxarmaq üçün istifadə olunan kartlardır. Banklar həmçinin müxtəlif riskləri (məsələn, başqaları tərəfindən istifadə olunmaq kimi) azaldaraq, öz kartlarını şəkilli və imzalı və müxtəlif adlarla təqdim edə bilərlər.

*Visa Gold kartlar.* Bunlar bankların öz prestijli müştərilərinə verdiyi, bankların siyasət və sistemlərinə uyğun olaraq ölkədaxili və xaricdə istifadə oluna bilən, müqavilə bağlamış banklar, maliyyə qurumları və şirkətlərlə alış-veriş və nağd pul çıxarmada istifadə olunan yüksək limitli kartlardır.

Visa firması (Brend) loqosu olan kartlar, müqavilə bağladığı şirkətlərin loqolarının yer aldığı və kart sahiblərinə müxtəlif üstünlüklər təmin edən və bütün viza kartı əməliyyatlarının edilə bildiyi kartlardır (Öztürk, 2001; 43).

Visa Türkiyə kart sayına görə Avropanın üçüncü ən böyük bazarıdır. Türkiyə bazarındakı kartların sayı Visa Europe Ltd.-dəki kartların ümumi sayının 10%-ni təşkil edir. Türkiyədə şəxsi istehlak xərclərində Visa-nın payı 9,3% təşkil edir. Visa vasitəsilə illik əməliyyat həcmi 32 milyard avrodan çoxdur. Visa Türkiyədə ödəniş sistemləri sənayesinin inkişafında və dəstəklənməsində mühüm rol oynamışdır. O, Visa üzv banklarına EMV uyğun çip kartlarına keçid üçün maksimum dəstək verir. O, Türkiyədə təhlükəsiz onlayn ödəniş əməliyyatları üçün ümumi platformanın yaradılmasında liderlik edir. Türkiyədə 25 üzv bankla fəaliyyət göstərir. 2004-cü ilin sentyabr ayının sonuna olan məlumata görə, Türkiyədə 26,8 milyon Visa markalı kart və 800.000-dən çox qəbul nöqtəsi var (http//www. bkm. com.tr).

Mağazaların banklar vasitəsilə müştərilərə təklif etdiyi ödəniş vasitəsidir. Mağaza kartları yalnız kartı verən mağazalarda etibarlıdır. Mağazalar müştərilərinin kartlarından istifadəni yaxşılaşdırmaq üçün şəbəkələr də inkişaf etdirir. Mağaza kartlarının kredit kartları kimi nağd pul çıxarma xüsusiyyəti yoxdur, lakin müştərilərə kartı verən mağazadan kreditlə alış-veriş etmək imkanı yaradır. Amerika və Avropa ölkələrində pərakəndə satış qrupları arasında geniş istifadə olunan mağaza kartlarının tətbiqi ölkəmizdə də iri şirkətlər tərəfindən həyata keçirilir.

Pərakəndə satıcılar müxtəlif yollarla kredit verirlər. Bəziləri, faktura tarixindən sonra iki-üç həftə ərzində ödənilməli olan aylıq və ya opsion hesabları şəklindədir. Digərlərində isə kart sahibinin aylıq ödənişinin 20, 30 misli limiti var. Bununla belə, mağazaların kredit limitləri və faiz dərəcələri ilə bağlı qaydalar çox fərqlidir. Bu tip kart emitent mağazasına yaxşı nümunə İngiltərədəki Marks & Spencer mağazasıdır. Marks & Spencer 1985-ci ilin may ayında ümummilli kredit kartı tətbiqinə başladı və həmin ilin birinci yarısında yarım milyondan çox mağaza kartı buraxdı.

Xidmət keyfiyyətinin tərifi ilə bağlı hələ konsensus olmasa da, üç tərifin olduğu müəyyən edilmişdir (Gözlü, 1994; 33). Bunlardan birincisinə görə, xidmət keyfiyyəti müştərinin gözləntilərinin faktiki xidmət göstəriciləri ilə müqayisəsidir. Gözləntilər müştərilərin keçmiş təcrübələrinə əsaslanır. Digər tərəfdən, xidmət performansına obyektlər, xidmət prosesi, avadanlıq, iş dizaynı, işçilər üçün mükafat və həvəsləndirmə proqramları, menecerlərin planları və qərarları təsir edir. Bu idarə oluna bilən amillərlə yanaşı, istehlakçı davranışı, iqlim, rəqiblərin təsiri və performansı kimi idarə olunmayan amillər də xidmət keyfiyyətinə təsir göstərir.

Müasir dövrdə istehlak kreditilərinin verilməsi kreditorlarla borcalan arasında razılaşdırılan müqavilə əsasında baş verir. Bu, kredit müqaviləsindəki ümumi qaydalara əsaslanır, predmetini isə borc verilən dəyərtəşkil edir. İstehlak kreditinin faizlərlə bərabər qaytarılması müqavilənin şərtlərində təsbit olunur. Həmçinin, ödənişlərin möhlətlə istifadəolunması informasiyalarına da rast gəlmək olar. Əgər istehlak krediti ilə əmtəə almaq istənilirsə, həmçinin ticarət mərkəzlərinin xidmətlərindən də faydalanmaq olar.

Kommersiya bankları isə istehlak məqsədlərində pul formasında ssudalar verə bilər. İstehlak krediti, onun vasitəsi ilə satılan və şəxsi ehtiyaclar üçün uzun müddət istifadə oluna bilən əmtəələrdən ibarətdir. Misal olaraq, əsas istifadə olunanlar: avtomobil, mebel, ev üçün elektrik avadanlıqları, kompyuter, telefonlar və s. qeyd oluna bilər.

Ümumiyyətlə Azərbaycan Respublikasında banklar haqqında qanunlarda istehlak kreditlərinin mənalandırılması və təsnifləşdirilməsi verilmir. «Banklar haqqında» qanuna müvafiq olaraq yalnız alınmış lisenziyada göstərilmək şərti ilə, istehlak kreditləşdirməsi bankların fəaliyyət sahəsində icazə verilən bir fəaliyyətdir. Yəni, bankların istehlak kreditləşdirilməsini təşkil etməyi dünya təcrübəsinə uyğun olaraq edilir.

Müvafiq olaraq, Azərbaycanda istehlak kreditlərinin verilməsinə və istifadə olunmağına əhalinin ehtiyacı duyduğu kimi, kommersiya banklarının da marağı var. Həmçinin qeyd edim ki, xarici praktikada istehlak kreditinin əhatə dairəsində fərqliliklər müşahidə olunur. Hal-hazırda, Azərbaycan

Respublikasında istehlak kreditlərinin (bütün kredit növlərinin) verilməsində əsas normativ akt Mərkəzi Bankın hazırladığı «Banklarda kreditlərin verilməsi qaydaları» (Təsdiqi: 18 noyabr 2008-ci il, protokol №34; 15 aprel 2010-cu il tarixli dəyişikliklərlə) hesab olunur. Bu qaydalara görə, «Kredit strategiyasına əsaslanaraq banklar bütün kreditlər üzrə həm kreditlərintəqdim olunması, həmdə onların monitorinqi və nəzarət üzrə ayrıca qaydalar müəyyən etməlidirlər. Əgər bank tərəfindən verilməyən hər hansı kredit növünə tələbat yaranarsa, bank yeni prosedur qaydaları müəyyən etməlidir.

İstehlak kreditlərinin verilməsi müddəti bankların sərbəst müəyyən etdiyi qaydadır. Ölkəmizdə təcrübədə adətən 1 aydan 24 aya qədər müddət ərzində istehlak ssudalarının verilməsi müşahidə olunur. Hər hansı bank öz istəyi ilə və imkanlarına görə daha artıq müddətin tətbiq edilməsi mümkündür.

Baxmayaraqki, İstehlak kreditlərinin verilməsi müddəti müxtəlif ola bilər, kreditin ödənişinin ümumi vaxtının müddətlərə bölünməsi və yaxud müddətlərə bölünmədən vahid vaxt qoyulması halları mümkündür. Bu məsələyə bir sıra ölkələrdə böyük əhəmiyyət verilir və istehlak kreditlərinin təsnifatı səviyyəsinə yüksəldilir. Bəzi ölkələrdə isə, istehlak kreditinin birdəfəyə və yaxud müddətlərə bölünərək ödənilməsinə ssudaların qaytarılması metodu kimi qəbul edilir.

Hissə hissə ödənilməyən kreditlərin xüsusiyyəti – belə kreditlərdə həm borcun, həmdə faizlərin qaytarılması eyni zamanda baş verir. Xarici təcrübədə bu tip kreditlərə “bridjing” kreditini misal şəkmək olar. Bu zaman fşəxsə yeni mənzil ilə köhnə arasında olan məbləğ fərqi verilir. Əgər kreditlər ödənişlərinin bölünmə metodu ilə verilirsə ödənişlər ayda 1 dəfə, vəya ayda 2 dəfə eyni məbləğlərlə ödənilir. Bu prosesin eynisi müddətlər saxlanılmaqla müxtəlif dövrlərdə ödənişin fərqli qaydasının müəyyən olunmasıdır. Ödənişin müqavilənin qüvvədə olanda qaytarılması bu proseslə eynilik təşkil edir. Əgər ssuda ödənişinin müddətlərə ayrılmadan yerinə yetirilsə, borcun və faizlərin qaytarılması birdəfəlik, və bu müqavilədə təyin olunan zamana görə başa çatdırılır. Bank sektorunun işçiləri əsasən kreditin aylar və kvartallara görə ödənilməsini təmin edirlər.

Təbiiki, kredit məbləğlərinin müddətlərlə hissə-hissə ödənilməsi daha real və səmərəli olsada, müəyyən səbəblərə görə ssudaların birdəfəlik qaytarılmasını üstün tutan müştərilərin olduğunu nəzərə almaq lazımdır. Müqavilə bağlananda bu məsələ qarşılıqlı maraqlara görə öz həllini tapır. Müddət ərzində qaytarılan kreditlər isə ya bərabər hissələrlə (aylıq, rüblük və s) və ya müxtəlif məbləğlər ilə müəyyən edilən vaxt çərçivəsində qaytarılır. Kredit hissələrlə qaytarılırsa müqavilədə ümumi məbləğ hissələrə bölünərək əks etdirilir. İstehlak kreditlərinin verilməsi zamanı banklar borcalanlar qarşısına müxtəlif tələblər qoya bilər: yaş həddi, daimi gəlirin olması, son iş yerində staj və s. Ölkəmizdə 21-65 yaş həddi vətəndaşlara istehlak krediti təqdim olunur.

Kreditlərə faizlərin əlavə edilməsi də müxtəlifliyə malikdir: ssuda təqdim edilərkən faizlərin əlavəverilməsi, kreditin ödənilməsi zamanı faizlərin verilməsi və faizlərin ödənilmə müddəti çərçivəsində hissələrə bölünərək verilməsi. İstehlak kreditlərinin bir neçə növü mövcuddur: təxirəsalınmaz ehtiyaclar üçün olan kreditlər, təmir məqsədi ilə verilən kreditlər, istirahət, müalicə üçün verilən kreditlər və s. Hər növün özünəməxsus üstünlükləri var. Təxirəsalınmaz ehtiyaclar üçün olan kreditin (bu kredit məqsədsiz verilən kredit də adlandırılır) üstün cəhəti odur ki, borcalan nağd pulu bilavasitə alır və ilkin olaraq haqqın ödənilməsi və pulun hansı məqsədlə xərclənməsi barədə məlumat vermək məcburiyyəti yoxdur. Bu kredit növü bəzən ipoteka kreditindən və avtomobil alınması üçün olan kreditdən daha sərfəli olur.

İstirahət üçün verilən kreditlər xarici ölkələrə turist səfəri zamanı maliyyə problemlərini həll edir. Pul vəsaitlərinin məhdudluğunu nəzərə alaraq seçim qarşısında qalmaq olar: qənaət edərək daha ucuz olan tur paket götürmək və ya səfəri təxirə salmaq. Hal hazırda ödənişi hissə hissə müddətlə ödənilən tur paketlər mövcuddur ki, hansı üçün ilkin olaraq haqq ödənilir qalan məbləği səfər başa çatdıqdan sonra ödəmək imkanı olur. Bəzi banklar isə istirahət kreditini ayrıca növ kimi ayırmır.

Müasir zamanda təmir işlərinə kifayət qədər çox rast gəlirik və bu proses böyük məbləğ tələb edir. Bu kredit növünü təqdim edərkən banklar adətən təmir edilən mənzili girov kimi götürür. Təmir üçün verilən kreditin təxirəsalınmaz ehtiyaclar üçün verilən kreditdən fərqi faiz dərəcələrini nisbətən aşağı olmasıdır (illik 16-17%). Başqa kredit məhsulları ilə müqayisə etsək "Təmir Krediti"-nin başlıca üstün cəhəti odur ki, müştərilər təmir üçün pul vəsaitini birdəfəlik deyil, təmir işləri gedərkən alır. Bununla da, faizlərdə qənaət olur və faiz ancaq kreditin alınan və istifadə olunan hissəsinə hesablanır.

## Nəticə

İstehlak kreditinin prinsipcə mahiyyəti əhaliyə istehlak üçün üçün təqdim olunan kreditlərdir. Yəni, hər hansı əmtəə, xidmət insanlara ödənişin möhlət hüququ ilə verilməsini ifadə edir. İstehlak krediti dünya təcrübəsində ticarət mərkəzləri, bank və digər kredit-maliyyə təşkilatları tərəfindən verilməsi qaydaları ayrı-ayrı ölkələrin müvafiq olaraq qanun və adətlərinə əsaslanır. Təbiiki, kreditor və borcalanların xüsusiyyətləri, istəkləri nəzərə alınır. Çünki bu hallarda bank qanunvericiliyində detallaşdırılan tələblərin, sahibkarlıq fəaliyyətində isə bərk məhdudiyyətlərin qoyulması ilə bazar iqtisadiyyatının prinsipləri pozulmuş olar.

İstehlak kreditləri əməyin effektivliyini çox yaxşı stimullaşdırır. Əmək haqqını aldıqdan sonra, xüsusən uzunmüddətli istifadə üçün malların alınmasına vəsait çatmayanda əhali həmin malları istehlak kreditləri vasitəsi ilə alır. Təbiiki, hər bir kredit götürən şəxs ödənişi həyata keçirə bilmək üçün uzun müddət iş yerindən ayrılmaq istəməyəcək. Yalnız bu zaman şəxs özünü krediti ödəmək qabiliyyətində, inamlı hiss edəcək.

Lakin nəzərə almaq lazımdır ki, istehlak kreditləri müddətli olaraq istehsalın həcmini artırmasına, yüksək konyukturanın yaradılmasına baxmayaraq, onların düzgün verilməməsi istehsalın əhalinin ödəniş qabiliyyətindən kənara çıxmasına və nəticə etibarı ilə iqtisadi krizislərə gətirib çıxara bilər.

## Ədəbiyyat

1. Abbasov Ə., Həmişəyeva Ş., Məmmədov Z., Rzayev R. Bank işi ilə elektron bankçılıq. Bakı 2013, 420 s.
2. Abdullayev Ş.Ə., Əsgərova R.V. “Bank işi”, Dərslik - 2017, 510 s.
3. Bağırov M.M. “Banklar və bank əməliyyatları” Dərslik. 2014, 480 s.
4. Bəşirov R.A. “Bank işi” Dərslik. 2017, 420 s.
5. Cavadov A.M., Kommersiya bankları məhsul və xidmətlərinə qiymət-qoyma. Bakı 2012, 480 s.
6. Əliyev M.F. Bankların inkişaf istiqamətləri. Monoqrafiya. Bakı, “Şərq-Qərb” Nəşriyyat evi, 2014, 120 səh.
7. Əliyev M.F., Bank məhsullarının inkişaf strategiyası. 2016, 346 s.
8. Əliyev M.F., Bank islahatları ilə vahid reytinq sistemi ilə qiymətləndirmə. Ekspert jurnalı, 2016-ci il, №3-4.
9. Hacıyeva L.A. “Xidmət sahələrinin marketinqi” Dərs vəsaiti - Bakı, 2017. 276 səh
10. Məmmədov Z.F. Bank fəaliyyətinin əsasları. (Elmi-nəzəri və praktki məlumat kitabı). Bakı, Azərnəşr. 2017. səh.480.

1. Muratoglu, Cem. Marketing and Sales in Retail Banking. Banks Association of Turkey Publications: Istanbul, 2018.
2. Ocal, Tezer. Banking sector. Turkish Economy “Sectoral Developments”, Turkish Economy Institution Publications, Ankara, 2018.
3. Ozturk, Sevgi Ayshe. Service Marketing, Anadolu University Faculty of Business Publications, No:1028, Eskishehir, 2018.
4. Teoman, Omar. Legal Credit Card Application. Economic Bank Educational Publications: Istanbul, 2016.
5. http//www.bkm.com.tr

**Rəyçi: dos. G.Musayev**

Göndərilib: 18.02.2022 Qəbul edilib: 14.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/143-147

**Hürnisə Nizami qızı Bağırzadə**
Qərbi Kaspi Universiteti
magistrant
baghirzade1997@gmail.com

# AİLƏDAXİLİ MÜNASİBƏTLƏR VƏ ONUN MÜASİR VƏZİYYƏTİ

**Xülasə**

Cəmiyyət inkişaf etdikcə onun dəyərləri daim dəyişir, yeni dəyərlər köhnələri sıxışdırıb çıxarır. Ailənin tarixi inkişafı buna əyani sübutdur.

Məqalədə qeyd edilmişdir ki, ailə sosial institut kimi onun hər bir üzvü tərəfindən sosial normaların mənimsənilməsini, ona əməl edilməsini izləyir və nəzarət etmək funksiyasını yerinə yetirir. İrəli yaşda qadınlar daha aktiv, kişilər isə əksinə passiv olurlar.

Sonda qeyd olundu ki, əgər gənc zamanın tələblərinə asanlıqla uyğunlaşırsa, yaşlılar isə bunu çətinliklə, dərk edirlər.Yaşlıların ənənəvi prinsiplərə əməl etdiyi halda, bu plandakı gənclər daha müasirdir. Gənclərin və yaşlıların fərqli dünyagörüşü təbiidir, xarakter xüsusiyyətləri ailənin yaradılmasında, ailədaxili münasibətlərin qurulmasında özünü göstərir. Bütün bu səbəblər araşdırılmalı, daha da insanların maariflənməsinə yönəldilməlidir.

***Açar sözlər:*** *ailə, uşaq, cəmiyyət, münasibət, tərbiyə, valideyn*

## Family relations and its current state

**Abstract**

As a society develops, its values are constantly changing, and new values displace the old ones. The historical development of the family is a clear proof of this.

In the article it has noticed, that the family as a social institute carries out function of mastering of social norms by its each member, followings by it, and the control item. In advanced age of the woman there are more active, and men, on the contrary, passive.

In the conclusion it has noticed, that if the youth with ease adapts for time requirements the elderly perceive it hardly. If the elderly adhere to traditional principles, the youth in this plan is more modern. The outlook, interests is natural, features of character of youth and older persons have been show at family creation, construction of intrafamily relations. All these reasons should have been investigate, and further directed on education of people.

***Key words:*** *family, child, society, attitude, upbringing, parent*

Ailə insanların qarşılıqlı fəaliyyətinin təkrarsız institutudur**.** Hər bir xalqın və cəmiyyətin mükəmməlliyi ailədən, iki şəxsin qarşılıqlı anlaşıb qurduqları yuvadan başlayır.Elə buna görə də, tərbiyənin özülü ailə yuvasında qoyulmalıdır ki, uzun ömürlü və davamlı olsun. Ailə tərbiyə əsasları üzərində qurulmursa, cəmiyyətin əxlaqlı olması da mümkün deyildir. Qüsursuz bir təlim və tərbiyə ideal insan yetişdirməkdə vacib amil olsa da, ailə tərbiyədə oynadığı roluna görə həmişə öz əhəmiyyətini qoruyacaqdır.

Cəmiyyət inkişaf etdikcə onun dəyərləri daim dəyişir, yeni dəyərlər köhnələrini sıxışdırıb, aradan çıxarır. Ailə institutunun tarixi inkişafı buna əyani sübutdur. Qədim dövrlərdən indiyə qədər ailə və nikahın tədqiqi bir çox elmlərin diqqətində olmuşdur və müasir zamanda ailə institutunun tədqiqinin tarix, etnoqrafiya, iqtisadiyyat, demoqrafiya, pedaqogika, psixologiya, sosiologiya və s. elmlər tərəfindən həyata keçirilməsi onun insan həyatında çox önəmli, əhəmiyyətli rolunu bir daha təsdiq edir. Hər bir tarixi mərhələdə cəmiyyətdə özünü göstərən inkişaf, yaranan problemlər, dəyişikliklər ailədə də öz əksini tapmışdır. Keçmişdə Azərbaycanda ailə münasibətlərinin müxtəlif formaları mövcud olmuşdur, əvvəllər mövcud olan adət-ənənələrin heç də hamısına bu gün rast gəlmək olmur.

Ailənin təkamül prosesinə nəzər salsaq: ailənin dəyişməsi promiskuitetdən (nizamsız cinsi münasibətlərdən) başlayaraq, qrup evliliyi, matriarxat və patriarxata, monoqomiyaya qədər təkamül yolu keçmişdir. Etnoqrafik tədqiqatlara əsaslanaraq insanlıq tarixini üç dövrə bölmək olar: vəhşilik,barbarlıq və sivilizasiya. Onlardan hər biri qadın və kişi münasibətlərinin dominant formasına, ailəsinə, özünəməxsus ictimai instutlarına malik olmuşdur. (1,s 4)

Dünya miqyasında çox sürətlə inkişaf edən qloballaşma nəticəsində mədəni dəyərlərin müxtəlif ölçülü deformasiyalara məruz qalması ailə tərbiyəsinin milli əsaslarını zəifləmişdir. Bütün bunların qarşısını almaq üçün, xalqın uzun əsrlər boyu ailə tərbiyəsi sahəsində toplanmış, həyati təcrübədə özünü doğrultmuş zəngin pedaqoji irsi öyrənilməli və çağdaş tərbiyə işində istifadə olunmalıdır.

Uşağın mükəmməl şəkildə, cismi, əqli, hissi və digər yönlərdən gözəl bir insan, şəxsiyyət kimi yetişməsində ailə mühitinin vacibliyi danılmazdır.

Eyni zamanda uşaq tərbiyəsi zamanı onlara mənəvi dəyərlərin aşılanması üçün ailə mühiti böyük əhəmiyyət kəsb edir.

*Cəmiyyətdə ailənin yeri*: Qeyd etməliyik ki, uşaqlar arasında fərqə yol verilməməlidir. Ana və ata uşaqların hər birinə fərdi yanaşmağı bacarmalıdır. Ailə fərdləri ilə birlikdə cəmiyyətin kiçik bir üzvüdür. Ailə cəmiyyətin əsas sütununu təşkil edir. V.Sısenkonun fikrincə, ailədə ər-arvad arasında hər hansı bir münaqişə maraqların, tələbatların, baxışların və təsəvvürlərin qarşıdurmasıdır. Bu müddəadan çıxış edərək, o göstərir ki, nikaha daxil olan qadınla kişinin hər biri özlüyündə potensial psixi zərbə amili ilə çıxış edir. Ailə canlı təsisatdır. O da dialektika qanunlarına tabedir. Bu mənada, məsələ heç də ailədə münaqişələrin olub-olmamasında deyildir. Bu, müəyyən mənada təbii haldır. Ən başlıca məsələ münaqişənin mənəvi məzmunudur. Psixi zərbə anlayışı ailə çərçivəsində insan münasibətlərinin formalaşmasından, iki “Mən”in “Biz”ə çevrilməsindən gedir.

S.A.Suxomlinski yazır:*“*Mən getdikcə daha çox inanıram ki, yeniyetmələrin əxlaqi siması insanın uşaqlıq illərində necə tərbiyə olunmasından, anadan olandan 10–11 yaşına kimi qəlbinə nə doldurduğundan asılıdır” Öz təbiətinə görə uşaqlıq yaşı valideynlərə və tərbiyəçilərə uşaqların verdiyi çətinlikləri verə bilməz. Uşaqlar, obrazlı deyilərsə, bir çiçəkdir: onun gözəlliyi bitkiyə qulluq edilməsindən asılıdır. Çiçəyin gözəlliyi üçün ona, açılmağa başlamazdan xeyli əvvəl qayğı göstərmək lazımdır.” (2, s 637)

Ailə kiçik qrupdur. Qrup isə adətən, paritet olmur, yəni onun üzvləri arasında şəxsiyyətlərarası münasibətlər bərabərlik əsasında, rəhbərlik və tabelik elementləri olmadan qurulmur. Ər və arvad o zaman ailə başçısına çevrilir ki, onun mənəvi nüfuzu həyat yoldaşı tərəfindən qəbul edilir. Bu proses adətən müxtəlif konfliktlərlə müşayiət olunur. Bəzi müəlliflər onu nikah adaptasiyası, bəziləri isə, obrazlı şəkildə *“ailə hakimiyyəti uğrunda mübarizə”* kimi xarakterizə edirlər. *“Psixi Zərbə“* amili də adətən bu zaman özünü göstərir. Ailənin formalaşdığı ilk mərhələdə açıq və gizli münaqişələrin tez-tez təzahür etməsi də bununla bağlıdır. (3, s 337).

Təcrübə göstərir ki, maddi təminatı yüksək olan ailələr xoşbəxt ailələr deyildir. Bəlkə də yüksək maddiyyat, qəribə də olsa, ailələrin dağılmasına gətirib çıxarır. Maddi problemlər ailənin sarsılmasının başlıca amilləridir. Qadın və kişinin bir-birindən iqtisadi baxımından asılı olması da məsələnin başqa bir tərəfidir.

Psixoloji tədqiqatlar göstərir ki, uğursuz ailə mühitində böyüyən uşaqlar böyüdükdən sonra uğurlu ailə qurmaqda çətinlik çəkirlər.

Psixoloqların sübut etdiyi digər bir həqiqət ondan ibarətdir ki, bir yaşın sonuna qədər uşağın yalnız şəxsiyyət kimi formalaşmasının əsası qoyulmur, həm də gələcək inkişafının sürəti müəyyənləşdirilir. Sübut olunmuşdur ki, uşaq həyatının birinci ayını anadan ayrı keçirərsə, bu, onun psixikasına son dərəcə pis təsir edir.

Uşaqlar ailənin tək hüquqlu üzvlərindəndir. Uşağa laqeyd münasibət nə qədər səhvdirsə, hədsiz məhəbbət də bir o qədər ziyandır.

Məşhur fransız filosofu, J.J.Russo yazırdı: *“*Bilirsinizmi uşağınızı bədbəxt etməyin ən rahat yolu nədir.? Bu, uşağın istəyinə heç vaxt yox deməməkdir.*”* (4, s 162-163)

Ailə səciyyəvi pedaqoji sistemdir. Sosioloqlar ailəni tam sosial orqanizmin hissəsi, cəmiyyətin hüceyrəsi, sosial tərbiyəedici kollektiv hesab edirlər. Başqa sosial kollektivlərdən (istehsalat, peşə, siyasi) fərqli olaraq ailə bir başa yenidənqurmaya məruz qalmır. Ailənin əxlaqı, psixoloji cəhətdən

dəyişməsi uzun müddət davam edən ziddiyyətli və mürəkkəb prosesdir. Cəmiyyətin struktur vahidi olan ailədə şəxsiyyətin əsası qoyulur. Ailə qan və qohumluq münasibətləri ilə bağlıdır.

Iki nəfərin evlənməsi hələ sözün əsl mənasında ailənin yaranması demək deyildir. Tam ailənin təşəkkülü və möhləmlənməsi uşaqların doğulması ilə bağlıdır. Ailənin funksiyası uşaq dünyaya gətirmək, insan nəslinin inkişafını təmin etməkdən ibarətdir. Ona görə də, ailə tərbiyəsinin təmin olunması, onun məzmun və təşkilatı aspektləri bəşəriyyətin əbədi və çox məsuliyyətli vəzifələrindən biridir.

Sosioloqların tədqiqatlarına görə, hazırda həll edilməsi tələb olunan mərkəzi problemlərdən biri, uşaq doğumunu nizamlamaq və ailəni planlaşdırmaqdır. Hazırki demoqrafik situasiya elədir ki, dünyanın bəzi ölkələrində təbii artım yüksək, bəzi ölkələrində isə aşağıdır. Azərbaycan ikinci qrup ölkələrə daxildir.

Şəxsiyyətin inkişafında müəyyənedici rolu sosial amillər oynayır. Çünki, şəxsiyyət sosial mahiyyət daşıyır və o, ictimai tarixi inkişafın məhsuludur, sosial mühitdə fəaliyyət və ünsiyyət prosesində formalaşır. Onun şəxsiyyət kimi inkişafı doğulandan vəfatına qədər davam edir. Şəxsiyyətin formlaşmasına təsir edən, kollektivin və bütövlükdə cəmiyyətin həyati vacib tələbatlarının ödənilməsini təmin edən sosial institutların: iqtisadi, siyasi, ailə, hərbi, dini, və ya ailə, siyasət, hüquq,iqtisadiyyat, təhsil, din, ordu kimi sosial institutların tarixi inkişaf prosesində dəyişməsi onun şəxsiyyətin formalaşmasına təsirində də özünü göstərir.

Ailədə tərbiyə prosesi və onun şəxsiyyətin inkişafına təsirində olan dəyişikliklər də diqqəti cəlb edir. Uşağın tərbiyə edilməsi formaları, metodları, onun söykəndiyi dəyərlər, bunun əsasında formalaşan valideyn-övlad münasibətləri tarixi inkişaf boyunca dəyişmişdir : (5, s 6)

Infintisid – uşaq öldürmə və uşaqlara qarşı zorakılıq (qədim dövrlərdən eramızdan əvvəl 4 əsrə qədər),

Uşağın atılması – uşaq dayəyə, başqa ailəyə, monastra və s verilir. (IV–XVII əsrlər),

Ambivalent – uşaqlar ailənin tam hüquqlu üzvləri deyil, onların fərdiliyi, müstəqilliyi qəbul edilmir, ideal sayılan"obraza"uyğun"şəkləsalınır", müqavimət göstərdikdə sərt şəkildə cəzalandırılır (XV–XVII əsrlər),

Zəhlətökən – uşaq valideyninə daha yaxın olur, onun davranışı ciddi şəkildə reqlamentləşdirilir, daxili aləminə ciddi şəkildə nəzarət edilir (XVIII əsr),

Sosiallaşdırma – valideynlərin cəhdləri uşaqların müstəqil həyata hazırlanmaları və xarakterin formalaşdırılmasına yönəlir; uşaqlar onlar üçün tərbiyə və təlim obyektidir (XIX əsr və XX əsrin əvvəli),

Yardımçı – valideynlər uşağın meyil və qabiliyyətlərini nəzərə almaqla onun fərdi inkişafını və emosional əlaqəni təmin etməyə cəhd edirlər (XX əsrin ortalarından hal- hazırkı dövrə qədər). (5,s. 6)

Uşaqlara hər şey hazır verilməməlidir. Məsuliyyət hissinin yaranması və onun inkişafı ailədə təşəkkül tapır. Ailənin uşağın qarşısında qoyduğu məsələləri yerinə yetirməklə uşaq qarşısına çıxan problemləri həll etməyi öyrənir.

Ailə mənəvi təməllərin qoyulduğu bir mühitdir. Ailənin inkişaf mərhələlərini uşaqların inkişaf mərhələləri ilə müqayisə etsək görərik ki, uşaq kimi ailənin də məktəbəqədər və ya yeniyetməlik dövrləri vardır. Bu dövrlərin özünəməxsus xüsusiyyətləri, əsas problemləri və həll yolları vardır. Məsələn, uşaqları məktəbə gedən ailəni "məktəbə gedən ailə" kimi adlandırmaq olar. Ailələri bu şəkildə adlandırmaq psixoloqlara həmin ailədəki problemləri daha tez həll etməyə köməklik göstərə bilər. ( 6, s 58-59)

Ailə maddi və mənəvi təlabatların ödənildiyi bir isti ocaqdır. Ailədaxili və şəxsiyyətləarası münasibətlər bütün dövrlər üçün psixologiyanın aktual problemlərindən biri olmuşdur.

Ailə ilk tərbiyə ocağıdır. Uşağın anadan olduğu gündən müstəqil həyata qədəm qoyana qədər bir şəxsiyyət kimi formalaşmasında, heç şübhəsiz, ailə müstəsna rol oynayır. Məhz buna görə də görkəmli pedaqoqlar, maarifpərvərlər, yazıçılar ailəyə xüsusi diqqət yetirməyi valideynlərə məsləhət görmüş, bu haqda qiymətli fikirlər söyləmişlər.

Azərbaycan cəmiyyətində baş verən köklü, əsaslı dəyişikliklər həyat və fəaliyyətin bütün sahələrinə, o cümlədən ailədaxili münasibətlərin formalaşmasına ciddi şəkildə təsir göstərmişdir və göstərməkdə də davam edir.

Cəmiyyət həyatında baş verən dəyişikliklər, iqtisadi-siyasi sistemin dəyişməsi bir tərəfdən özünün sosial, hüquqi təsirini göstərirsə, digər tərəfdən də mənəvi-əxlaqi dəyişikliyə səbəb olur. Bütün bunlar isə kompleks şəkildə psixoloji təsir vasitəsinə çevrilir.(7.s 47)

Cəmiyyət həyatında baş verən dəyişikliklər, yeniləşmə insanlardan bir tərəfdən qloballaşmaya, dünya dövlətlərinə inteqrasiyanı tələb edirsə, digər tərəfdən də milli xüsusiyyətlərimizin, adət-ənənələrin qorunmasını, inkişaf etdirilməsini tələb edir.Bütün bunlar həm ayrı-ayrı şəxslərin həyat və düşüncə tərzinə, həm də bütövlükdə ailə həyatına, ailədaxili münasibətlərə təsir edir.Lakin insanlar cəmiyyət həyatında baş verən belə dəyişikliyə psixoloji baxımdan hazır deyillər və bu hal cəmiyyətdə, eləcə də ailələrdə bir sıra problemlərin yaranmasına səbəb olur.(8. s 47)

Məlum olduğu kimi, tarixən Azərbaycan ailələrində adətən ailə başçısı ata (kişi) olmuşdur. Ailənin digər üzvləri, bir qayda olaraq , onun iradəsini qəbul etmişlər.Ana isə əsasən ev işlərini yerinə yetirən, uşaqların tərbiyəsi ilə məşğul olan şəxs rolunda çıxış etmişdir.Ailənin sosial,iqtisadi problemlərini isə ata həll etmişdir. Doğrudur, ötən əsrin ikinci yarısından etibarən qadınlar da bu sahədə əsas olmasa da köməkçi,yardımçı rolunu oynamışlar.(9. s 49)

Müasir Azərbaydcan ailələrində, xüsusilə iri şəhərlərdə ailənin strukturunda, rol bölgüsündə, sosial, iqtisadi problemlərin həllində qadınların rolu xeyli artmışdır.Bu istər-istəməz qarşılıqlı münasibətlərin qurulmasında, rol bölgüsündə, bütövlükdə psixoloji xüsusiyyətlərin yeniləşməsində öz əksini tapmışdır.(10. s 49)

Müasir dövrdə ailə münasibətlərində baş verən digər bir dəyişiklik isə ənənəvi ailə münasibətlərinin eqolitar ailədə ər və arvadın sosial-iqtisadi funksiyalarının bərabərləşməsi sferasına transformasiyası ilə bağlıdır.Əgər əvvəllər kişinin ailə başçısı rolu ona ailənin sosial-iqtisadi təminatçısı və idarəçisi statusunu verirdisə, indi bu status müəyyən qədər ər-arvad arasında bölünür. Bu isə qadının kişidən xeyli dərəcədə sosial-iqtisadi asıllığını azaldır.Əgər kişi belə bölgüyə müqavimət göstərirsə, belə halda münasibətlərdə yaranan problemlər adətən boşanma yolu ilə həll edilir.(11. s 50)

Tədqiqatlar göstərir ki, sosial-iqtisadi təminatı yüksək olmayan ailələrdə də münasibətlərdə problem yaranır. Bu özünü ilk növbədə ər-arvad münasibətlərində, onların vasitəsilə övlada münasibətdə öz əksini tapır.(12)

Müasir ailələrin əksəriyyəti qüvvələrini əsasən, ailənin mənəvi inkişafına yox, maddi problemlərin həll edilməsinə ayırırlar. Tədqiqatlara görə, işləyən ana uşaqlarına hər gün 16 dəqiqə vaxt ayıra bilir, bazar günləri isə bu 30 dəqiqə olur. Valideynlərlə uşaqların mənəvi ünsiyyəti, onların birgə fəaliyyəti nadir hallarda olur. Əsasən, bir-biriləri ilə məktəbə gedərkən və axşam ev tapşırıqlarını yerinə yetirərkən ünsiyyət qururlar.

Zəhmətkeş ailələrin əksəriyyətinin iqtisadi səviyyəsinin aşağı olması, ailədə qadının iki qat artıq yüklənməsi, onun həm işdə, həm də ailədə işləməsi, ictimai həyatın mədəni səviyyəsinin aşağı olması, boşanma hallarının çoxalması, qohumlar arasında münaqişələrin yaranması, ailə ilə məktəb arasında əlaqələrin zəifləməsi ailənin əsas ana sütununu sarsıdan səbəblərdir.

Ailənin cəmiyyətdəki nüfuzunu aşağıdakı misal ilə daha da aydınlaşdırmaq olar. Adətən uşaq birinci yerə onun üçün daha çox nüfuz sahibi olan, daha çox yaxınlıq etdiyi adamı qoyur. Böyüklərdən adı axırda çəkilən şəxs uşaq üçün az əhəmiyyətli və ya onunla "pis münasibətdə" olandır. Ailə üzvlərindən yaddan çıxan olursa, demək ki, uşaq üçün daha az nüfuz sahibidir və ya psixoloji bağlılıqları zəifdir. Əgər sən "ailə" oyunu oynasaydın, ilk növbədə kimlərlə oynayardın? Onların adını sıra ilə saya bilərsən mi? Atan,anan,özün; anan ,atan,özün; özün ,atan, anan. "Əgər valideynlərin evdə olmasa, ilk növbədə kimi gözləyərdin, ananı, atanı yoxsa atanı, ananı?"

Ailənin uşaqlar üzərində nə qədər böyük təsiri olduğunu onların çəkdikləri "Ailə" rəsmlərində də görmək olar. Bütün bunlar göstərir ki, ailə cəmiyyətin sütunudur, milli mənəvi dəyərlərin qorunub saxlanmasında ən vacib ünsürdür.

Ailədən danışarkən uşaq və yeniyetmələrin şəxsiyyət kimi formalaşmasına təsir göstərən amilləri vurğulamaq yerinə düşərdi. Uşaqların erkən dövrdən əlverişsiz və sosial dəyişikliklər şəraitində yaşaması onların fiziki və psixi sağlamlığında bir sıra problemlər yaradır.

Uşaq və yeniyetmələrin psixi sağlamlığının pozulması intihar hallarına, psixoaktiv maddələrdən istifadəyə, zorakılığa, cinayətkarlığa, müstəqil yaşamaq vərdişlərinin olmamasına, sosial dezadaptasiyaya, şəxsiyyətin deqradasiyasına gətirib çıxarır. Bu cür mənfi halların aradan qaldırılması və ya önlənməsi üçün uşaqların psixi sağlamlığına təsir göstərən amillərin əsaslı şəkildə öyrənilməsi mühüm əhəmiyyət daşıyır. Bu zaman uşaq və yeniyetmələrin yaş xüsusiyyətləri nəzərə alınmalı, həm ailə, həm yaşıdlar, həm də məktəb mühitindəki münasibətlər sistemi araşdırılmalıdır.

Hər bir dövr üçün,xüsusilə də müasir dövrdə ailə münasibətləri xüsusi əhəmiyyət kəsb etmişdir.Ailədaxili münasibətlərin xarakteri hər bir ailə üzvünün psixikasına birbaşa və ya dolayı yolla təsir göstərir. Bütün ailə üzvlərinin münasibətləri və bu münasibətin onların emosional vəziyyətinə necə təsir göstərdiyi ayrı-ayrılıqda tədqiq edilməlidir.

## Ədəbiyyat


1. Silyaeva E.G. Ailə konsultasiyasının əsasları ilə ailə münasibətlərinin psixologiyası, Moskva, ACADEM, 2005, səh. 4.
2. Xəlilov H.Ə., Qloballaşma prosesi zamanı şəxsiyyətin formalaşmasında ailənin və təhsilin əhəmiyyəti, International Scientific Conference Of Young Researchers-Baku\ Azerbaijan 201, s.637 .
3. Bayramov Ə.S., Əlizadə Ə. Sosial psixologiya, Bakı, səh. 337
4. Əliyev R.I. Tərbiyə psixologiyası. Bakı, səh. 162–163
5. 5.Silyayeva E.G. Ailə konsultasiyasının əsasları ilə ailə münasibətlərinin psixologiyası, Moskva, ACADEM, 2005, səh. 6
6. Baldik Omer, Encyclopedic Education and Psychology Guide. Timash Publications, 2004, p.58-59
7. http://psixologiyajurnali.az/content_files/psixologiya_2011-4.pdf
8. 8.http://psixologiyajurnali.az/content_files/psixologiya_2013-3.pdf
9. 9.Psixologiya jurnalı 2014 . səh 49.
10. Psixologiya jurnalı, 2014 no 4, Səh 49
11. Psixologiya jurnalı, 2014 no 4, Səh 50.
12. Bayramov Ə.S., Əlizadə Ə. Sosial psixologiya, Bakı


**Rəyçi: psixologiya e.f.d. M.Mustafayev**

Göndərilib: 16.02.2022 Qəbul edilib: 13.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/148-152

**Günay Araz qızı Hüseynova**
Azərbaycan Dillər Universiteti
bakalavr tələbəsi
gunayhuseynovaa00@gmail.com

# ŞİMALİ VƏ CƏNUBİ KOREYANIN İQTİSADİ SİSTEMİNİN OXŞAR VƏ FƏRQLİ XÜSUSİYYƏTLƏRİNİN TƏHLİLİ

**Xülasə**

1910-cu ildə Yaponiya tərəfindən müstəmləkə halına salına salınmış vahid dövlət olan Koreya İkinci Dünya Müharibəsinin sonunda müvəqqəti olaraq ekvatorun şimal enliyinin 38-ci paraleli üzrə Sovet hakimiyyəti tərəfindən dəstəklənən Şimali Koreyaya və ABŞ tərəfindən dəstəklənən Cənubi Koreyaya bölündü. Ölkənin bölünməsindən beş il sonra, 1950-ci il 25 iyun tarixində Şimali Koreyanın kommunist lideri Kim İl Sonq Koreyanı öz nəzarəti altında birləşdirməyə məqsədi ilə Cənubi Koreyaya qəfil işğala başladı. Müharibə 27 iyul 1953-cü ildə Koreya Sülh

Müqaviləsinin imzalanması iki ölkə arasında Demilitarizasiya zonası yaradılması və ilə başa çatdı.

***Açar sözlər:*** *Cənubi Koreya, Şimali Koreya, "Gün işığı" siyasəti, iqtisadiyyat, mədəniyyət, media*

**Gunay Araz Huseynova**

## Analysis of similarities and differences between the economic systems of North and South Korea

**Abstract**

At the end of World War II, Korea, a unified state colonized by Japan in 1910, was temporarily divided into Soviet-backed North Korea and US-backed South Korea along the 38th parallel of the northern equator. Five years after the country's partition, on June 25, 1950, North Korean communist leader Kim Il Sung launched a surprise invasion of South Korea with the aim of uniting Korea under his control. The war ended with the signing of the Korean Peace Treaty on July 27, 1953, and the establishment of a demilitarization zone between the two countries.

***Key words****: South Korea, North Korea, Sunshine policy, economy, culture, media*

Koreya Müharibəsi, ABŞ və müttəfiqlərinin kommunizmin yayılmasını dayandırmağa çalışdıqları üçün Soyuq Müharibə dövründə baş verən bir neçə hərbi münaqişədən biri idi. Koreya müharibəsi 1950-ci il iyunun 25-də Sovet tərəfindən dəstəklənən kommunist Koreya Xalq Demokratik Respublikasının İkinci Dünya Müharibəsinin sonunda qalib müttəfiqlərin razılığı ilə fiziki olaraq Koreyanı iki hissəyə bölən 38-ci paraleldən qərbyönümlü Cənubi Koreyaya hücum etməsi ilə başladı. Koreya Müharisindən öncə Şimali və Cənubi Koreya dövlətləri Koreya adı altında vahid ölkə idi. Müharibədən sonra Koreya iki ölkə oldu. Şimali Koreya bu müharibəni başlatmaqla Cənubi Koreyanı işğal edərək iki xalqı kommunist rejim altında vahid ölkə kimi birləşdirməyi ümid edirdi. Şimali Koreyanın Cənubi Koreyanı işğal etməsi ilə ABŞ kommunizmin yayılmasından qorxurdu. Şimali Koreyanı bu cəhdinin qarşısını almaqda qərarlı olan ABŞ Cənubi Koreya ordusuna dəstək verdi. [1]

Amerika Birləşmiş Ştatları müharibədə Cənubi Koreya tərəfindən çıxış etsə də müharibənin uzanmaması üçün Şimali Koreya ilə barışıq yaratmaq üçün çalışdılar. Bunun səbəbi isə ABŞ-ın Şimali Koreyanı dəstəkləyən Çin və SSRİ ilə ehtimal olunan daha böyük müharibədən ehtiyat etməsi idi. Vəziyyət bu həddə çatmadan 1953-cü ilin iyulunda Koreya müharibəsi başa çatdı. Birinci Dünya Müharibəsi, İkinci Dünya Müharibəsi və Vyetnam Müharibəsi kimi daha böyük müharibələrlə müqayisədə ABŞ-da çoxlarının "Unudulmuş Müharibə" adlandırdığı müharibədə 5 milyona yaxın əsgər və mülki şəxs həyatını itirdi. [2, s.10]

Koreya Müharibəsi İkinci Dünya Müharibəsindən sonra iki blok arasında yaranan ilk və yəqin ki, ən mühüm qarşıdurmadır. Bu, təkcə keçmişin məsələsi deyil. Çünki müharibəyə səbəb olan məsələlər hələ də əsasən həll olunmamış qalmışdır və onun nəticələri hələ də həm regional, həm də qlobal hadisələrə və siyasətlərə təsir etməkdə davam edir. İkinci Dünya Müharibəsindən sonra koreyalıların məruz qaldığı bölünmə o qədər kəskin idi ki, Koreya hələ də iki düşmən dövlətə bölünmüş bir xalq olaraq qalır.Biri kommunist diktaturası, digəri isə daim yeni münaqişə ərəfəsində olan demokratik dövlətdir. Bunun, əslində, 20-ci əsrin əvvəllərində Böyük Dövlətlərin Koreya üzərində hakimiyyət mübarizələrində, eləcə də 1945-ci ilin sentyabrında Yaponiyanın təslim olmasından sonra baş verən hadisələrlə də əlaqəsi var.

Müharibənin nəticəsi olaraq 1953-cü ildəki parçalanmadan sonra hər iki dövlət kəskin şəkildə fərqli iqtisadi yollara getdi. Mərkəzləşdirilmiş planlı iqtisadiyyat altında olan Şimal Koreya öz təbii ehtiyatlarının təcrid olunmasına diqqət yetirdi və xarici ölkələrlə ticarət əlaqələrini minimuma endirərək Asiyanın ən kasıb iqtisadiyyatlarından birinə sahib ölkələrindən birinə çevrildi. Azad bazar iqtisadiyyatına keçən Cənub Koreya isə qlobal bazar inteqrasiyası və yüksək texnologiyalı sektorlarının genişləndirilməsi istiqamətində çalışaraq Asiyanın 4-cü ən böyük iqtisadiyyatına sahib ölkəsinə çevrildi. [3, s.102]

Uzun müddətdir ki, Kim sülaləsi tərəfindən idarə olunan Şimali Koreya dünyanın ən təcrid olunmuş ölkələrindən biridir. Prezident Kim Çen İnin hərbi diktatura rejimində digər sahələrlə olduğu kimi ölkə iqtisadiyyatı, istehsalatı və ərzaq paylanması ciddi nəzarət altında həyata keçirilir.

İqtisadiyyatın hazırki vəziyyəti ölkənin nüvə silahi yaratmaq ambisiyasını iqtisadiyyatdan və iqtisadiyyatı inkişaf etdirməkdən üstün tutur. Ölkə nüvə proqramı ilə bağlı beynəlxalq sanksiyalara görə təcrid olunduğundan və hökumətin açıqladığı rəqəmlər etibarlı mənbə hesab olunmadığından illik iqtisadi hasilatı haqqında dəqiq məlumat yoxdur.

Şimali Koreyada iqtisadi fəaliyyətlərin əksəriyyəti hökumət tərəfindən idarə olunur və digər kommunist ölkələri istisna olmaqla digər ölkələrlə heç bir ticarət əlaqəsi yoxdur. Ölkədə əsas iqtisadi problemlərdən biri aclıqdır. [4, s.88]

Birləşmiş Millətlər Təşkilatının ərzaq yardımına baxmayaraq, aclığın səviyyəsi sürətlə inkişaf edir. Hətta 1990-cı illərdə yaşanan qıtlıq ölkə iqtisadiyyatına mənfi təsir göstərən əsas göstəricilərdən biri olaraq qəbul edilir.

Dünya Bankının məlumatına görə, 2017-ci ildə Şimali Koreyalıların yarıdan çoxu elektrik enerjisindən məhrum idi. Ölkənin 1950-1960-cı illərdən bəri rəsmi dövlət ideologiyası olaraq qəbul edilən koreya xalqının “inqilab və quruculuq ustası” kimi çıxış etdiyi, əsasında xalqın yalnız özünə inamlı və güclü olduğu təqdirdə əsl sosializmə nail olacağı fikri dayanan "Cuçe" ideologiyasına baxmayaraq dövlət müntəzəm olaraq bir neçə ölkə və Birləşmiş Millətlər Təşkilatı kimi beynəlxalq qurumlardan yardım alır. İqtisadi və diplomatik cəhətdən isə yardım üçün ən böyük dəstəkçisi olan Çinə güvənir. [5]

2021-ci ilin yanvar ayında koronavirus pandemiyasının başlanğıcında Pxenyan və Çin-Koreya sərhədlərinin bağlanması və bütün ticarətin dayandırılması Şimali Koreyanın iqtisadi vəziyyətinə daha da mənfi təsir göstərdi. Pandemiyadan əvvəl də ölkə iqtisadiyyatı ABŞ və BMT tərəfindən nüvə və raket proqramlarına yönəldilən sanksiyalar altında artıq mübarizə aparırdı.

Digər tərəfdən, şəxsi biznesin rəqabət şəraitində fəaliyyət göstərdiyi və əsasən, dövlət nəzarətindən azad olduğu Cənubi Koreya bazar iqtisadiyyatına görə dünyanın qabaqcıl ölkələrindən biri hesab edilir. Koreya müharibəsindən sonra Cənubi Koreyanın iqtisadiyyatındakı müsbət yönə doğru köklü dəyişim xalq arasında “Hanq çayı üzərində möcüzə” adlandırılır. Müharibənin gətirdiyi yoxsulluqdan əziyyət çəkən və siyasi xaos içərisində olan Cənubi Koreya qısa vaxt ərzində dünyanın aparıcı iqtisadiyyatlarından birinə çevrildi. İndi Asiyanın 4-cü, dünyanın isə 14-cü ən böyük iqtisadiyyatı hesab olunur.

Cənubi Koreya 1960-cı illərin əvvəlindən 1990-cı illərin sonuna qədər dünyanın ən sürətlə inkişaf edən iqtisadiyyatlarından birinə sahib idi və hazırda da "Asiya Pələngləri" olaraq bilinən Honq Konq, Sinqapur və Tayvanla birlikdə ən sürətlə inkişaf edən ölkələrdən biridir. İqtisadiyyatının əsasən beynəlxalq ticarətdən asılı olduğu Cənubi Koreya 2010-cu ildə dünyanın altıncı ən böyük ixracatçısı və onuncu ən böyük idxalçısı olmuşdur.

Cənubi Koreya hazırda ümumi daxili məhsula görə dünyanın 12-ci ən böyük iqtisadiyyatına malikdir. Elektronika, telekommunikasiya, avtomobil və kimya sektorlarında uğurlu ticarət həyata keçirən Cənubi Koreya Samsung Electronics, LG, Hyundai Motors və KİA da daxil olmaqla dünyanın ən məşhur brendlərinin vətənidir. Ölkənin təbii resursları demək olar ki, olmadığı üçün Cənubi Koreya ixracyönümlü strategiyaya keçmişdir.

1998-ci ildə Cənubi Koreyanın prezidenti Kim De Cunqun rəhbərliyi altında iki ölkə arasındakı qarşılıqlı əlaqələri, mübadilələri və iqtisadi yardımları artıraraq Şimali Koreyanın cənuba münasibətini yumşaltmaq məqsədilə "Gün işığı" adlı siyasəti qəbul edildi. [6]

Bu siyasət adını əfsanəvi yunan təmsil ustası olan Ezopun "Şimal Küləyi və Günəş" adlı nağılından almış, əsasında isə düşmənlərinə zərər verməmək üçün onlara hədiyyə vermək düşüncəsini aşılayan fikir dayanır. Cənubi Koreyanın "Gün işığı" siyasəti silahlı təxribatdan istifadə edilmədiyini, Cənubi Koreyanın Şimalı Koreyanı məğlub etmək kimi bir niyyətinin olmadığını göstərən prinsipə əsaslanırdı. Bu siyasət iki ölkə arasında sülh yönümlü bəzi tarixi hadisələrə səbəb olmuşdur. 2000-ci ilin iyunu və 2007-ci ilin oktyabr aylarında Pxenyanda keçirilən iki dövlət arası sammit ilə yanaşı Koreya Müharibəsi nəticəsində bir-birindən ayrı düşmüş ailə üzvlərinin görüşləri baş tutmuşdur.

2000-ci ildə prezident Kim De Junq "Gün işığı" siyasətinin uğurla həyata keçirilməsinə görə Nobel Sülh Mükafatını ilə təltif olunmuşdur. Lakin 2008-ci ilin mart ayından etibarən Cənubi Koreyanın yeni prezidenti İ.Myon Bak və onun mühafizəkar Böyük Milli Partiyası Şimali Koreyaya qarşı fərqli mövqe tutmağa başladılar. Həmçinin, həmin dövr ərzində Şimali Koreyanın raket sınaqları kimi hərbi addımlar atması ilə iki ölkə arasındakı münasibətlər yenidən soyudu. [7]

2010-cu ilin noyabrında Cənubi Koreyanın Birləşmə Nazirliyi "Gün İşığı" siyasətini rəsmi olaraq uğursuz elan etdi və bununla da siyasətə son qoyuldu.

2017-ci ildə Mun Ce İnin Cənubi Koreyanın prezidenti seçilməsindən sonra Cənubi Koreya Şimali Koreyaya yenidən sülh yönümlü yaxınlaşmağa başladı və bu da "Gün İşığı" siyasətinin yenidən canlanmasına səbəb oldu. "Gün işığı" siyasəti ilə sələflərinin yolundan gedən Mun Ce İn sonda əlaqələrin yenidən pisləşməsinə baxmayaraq şimaldakı həmkarı ilə müəyyən məsafələr qət edə bilib.[8]

Mun Ce İnin iki dövlət arasındakı münasibətləri yaxşılaşdırmaq üçün göstərdiyi səy bir il ərzində Şimali Koreya və Cənubi Koreya arasında bir neçə sammitin keçirilməsi ilə nəticləndi. İki ölkə arasındakı gərginliyin azaldılması və digər sülh məqsədi daşıyan addımlar sayəsində prezident Mun Ce İnin siyasəti "Ay İşığı" siyasəti kimi tanınmağa başladı. Şimali Koreyanın iqtisadi göstəricilərinə kömək etmək, yaşayış keyfiyyətini yaxşılaşdırmaq üçün Cənubi Koreyanın "Gün İşığl" siyasəti yüksək qiymətləndirilə bilər. Cənubi Koreyanın Şimali Koreyaya qarşı bu siyasəti Şimalda yaxşı yaşayış səviyyəsi, daha yaxşı həyat standartı, ali təhsil, iqtisadi açıqlıq, azadlıq və siyasi rejimdə dəyişiklik yarada bilərdi. Digər tərəfdən, bu yardımlar şimalda avtoritar rejimi alovlandıra bilər və onların nüvə planını gücləndirmək kimi təhlükəli niyyətlərini təşviq edə bilərdi. Bu yumşaq siyasət iki ölkə arasında qarşılıqlı etimadın artmasına, gələcəkdə də əlaqələrin sülh yönümlü reallaşdırılması üçün şəraitin yaranmasına kömək etsə də, şimalda böyük dəyişiklik yaratmadı.[9]

Hətta bütün bu səylər nəticəsində Şimali və Cənubi Koreya arasında atəşkəslə başa çatan Koreya müharibəsinin rəsmi sona çatdığını elan etmək üçün prinsipial razılığa gəlinmişdi. Bununla belə, Şimal bəzi şərtlər irəli sürür: ABŞ hərbçilərinin Cənubi Koreyada olması; ABŞ və Cənubi Koreya arasında hər il keçirilən birgə hərbi təlimlər; həmçinin Şimali Koreyanın silah proqramına qarşı ABŞ-ın rəhbərlik etdiyi sanksiyalar. Hər iki ölkə arasında əlaqələr 2018-ci ildə Cənubi Koreya prezidenti Mun Ce İn və Şimali Koreya lideri Kim Çen İnın üç dəfə görüşməsi ilə daha yaxşılaşmışdır. Həmin ildə Şimali Koreyanın 2018-ci il Qış Olimpiya Oyunlarında iştirakı ilə başlayan münasibətlər böyük diplomatik sıçrayış gördü və əhəmiyyətli dərəcədə istiləşdi. 2018-ci ilin aprelində prezident Mun Ce İn və Kim Çen İn arasında Koreya yarımadasınında sülh və firavanlığın qorunması, həmiçinin yarımadanın birləşməsi üçün Panmuncom Bəyannaməsini imzalamışdır.

Lakin bu hal prezident Kim və o vaxtkı ABŞ prezidenti Donald Tramp arasında ikinci sammitdən sonra tez bir zamanda pozuldu. Gərginlik daha sonra cənubdakı defektor qruplarının sərhəddən təbliğat göndərməsi ilə daha da pisləşdi. Şimali Koreya aydın şəkildə bildirdi ki, prezident Mun Ce İnin

idarəçiliyi altında olan Cənubi Koreya Seulun tez-tez, ardıcıl və yaxşı niyyətli cəhdlərinə baxmayaraq, mövqeyini dəyişdirmək gücünə malik deyil.

Şimali Koreya 1990-cı illərdə bütün ölkəni bürüyən geniş miqyaslı aclıq zamanı təhsildən yayınan və təhsili yarımçıq qalmış əhalinin müəyyən edilməsi və maarifləndirilməsi üçün ümummilli sorğu keçirməyi əmr etmişdir. Şimali Koreyada " Çətin Yürüyüş " kimi tanınan 1994-1998-ci illərdəki aclıq səbəbilə milyonlarla insanın, bəzi hesablamalara görə ölkə əhalisinin 10%-i həyatını itirmişdir. Həmin hadisənin baş verməsindən 20 ildən çox keçsə də, humanitar böhran zamanı məktəbə gedə bilməyən və təhsilini davam etdirə bilməyənlərin çoxu hələ də oxuma-yazma bilmir. Hökümət ölkənin savadsızlıq dərəcəsini minimuma endirdiyini bildirsə də, bu sahədə görüləcək işlər çoxdur. Şimali Koreyanın təhsil sistemi özünəməxsus strukturlarını qoruyub saxlamışdır. "Cuçe Doktrinası" xüsusilə Şimali Koreys təhsil sisteminin ideologiyası və məqsədlərində öz əksini tapmışdır. Digər sahələrdə olduğu kimi təhsil sahəsində də Şinali Koreya haqqında çox az məlumat var. Yalnız çox məhdud sayda rəsmi dərc edilmiş mənbələrdən və Şimali Koreyadan olan fərari və qaçqınlarla müsahibələrdən əldən edilən məlumatlara əsasən, ölkənin təhsil sisteminin fəaliyyət strategiyaları və onun nəticələrinə dair bəzi fərziyyələr irəli sürmək mümkün olur.

Digər tərəfdən Cənubi Koreya savadlılıq dərəcəsinə, oxuma-yazma bilən vətəndaş sayına, riyaziyyat və digər elmlər üzrə yüksək nəticələrinə görə İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı ölkələri arasında dünyanın ən yüksək təhsilli işçi qüvvələrindən birinə malikdir. Resursları zəngin olmayan ölkə qlobal təhsildə ilk ardıcıl olaraq ilk sıralarda yer tutur.

2021-ci ilin sonlarında Şimali Koreya vətəndaşının Cənubi Koreyanın istehsalı olan Netflix platformasında yayımlanan dünyaca məşhur serialı "Squid Game"in nüsxələrini ehtiva edən USB-ni qaçaqmalçılıq yolu ilə keçirmək və satmaq ittihamı ilə güllələnmə cəzasına məhkum edildiyi bildirilir. Bunun sadəcə həmin vətəndaş üçün yox, həmçinin digərləri üçün də xoşagəlməz nəticələri oldu. USB-ni alan tələbəyə ömürlük həbs cəzası verildi, seriala baxan altı tələbə beş il ağır iş cəzasına məhkum edildi, hətta tələbələrin müəllimləri və məktəb işçiləri işdən çıxarılaraq qovulub. Başqa bir hadisədə isə 20 yaşlarında bir əsgər Cənubi Koreyanın dünyaca məşhur pop qrupu BTS-in rəqsini ifa etdiyi üçün həbs edilib. Bu hadisələr Şimali Koreyada hökümətin rejiminin öz vətəndaşlarının Cənubi Koreya mədəniyyətinə məruz qalmaması üçün həyata keçirdiyi davamlı repressiyasılarla bağlı suallar doğurur. 2004-cü ildə yarandığı vaxtdan bəri hökumət bölməsi, Müşahidə Bürosu Qrupu 109 (Sanqmu 109) vətəndaşların elektron cihazlarına demək olar ki, tam nəzarət edir və xarici serialların və filmlərin izlənməsini qanunsuzluq olaraq qiymətləndirir. Rejimin nəzarəti kifayət qədər ardıcıl olub.Rejim 2020-ci ildə "İrticaçı düşüncənin və mədəniyyətin ləğvi haqqında" qanunu dərc edib. Qanun xarici mədəniyyətə məxsus materialların saxlanmasına və ya yayılmasına görə 15 ilə qədər əmək düşərgəsi və ya ölüm cəzasını nəzərdə tutur. Qanunun əsas məqsədi əhalinin düşüncə və davranışlarına nəzarət etməkdir. Qanun xarici serialları, filmləri, musiqi videolarını "mürtəce" və ya "təxribatçı" hesab edir. [10]

2021-ci ildə Şimali Koreyanın dövlət qəzeti-Rodonq qəzetində, gənc nəslə Cənubi Koreya vətəndaşlarının dəbindən və ya saç düzümlərindən təsirlənməməyi, hətta onların sözlərini işlətməməyi açıq şəkildə əmr etdi və Kim Çen In K-pop-u "qəddar fəlakət" olaraq adlandırdı.[11]

Şimali Koreya rejimi isə xarici mədəniyyətin təsiri ilə Şimali Koreya vətəndaşları arasında şəxsi həyatda daha böyük fərdi azadlıqlar və bazar iqtisadiyyatının qəbulu kimi tələblərə səbəb olacağından çəkinir. Kim Çen İnin şiddətli cəzalarla birlikdə insanların gündəlik həyatına təsir edən təbliğata hərtərəfli nəzarət etmək üçün öz diktator siyasi gücündən istifadə etməsi cəmiyyətin norma və konvensiyalarını formalaşdırmağa, insanların düşüncə və davranışlarına nəzarət etməyə imkan verir. [12]

Yaxın vaxtlara qədər Koreya Xalq Demokratik Respublikası haqqında ən diqqət çəkən məsələ ölkə haqqında əsaslı məlumatların azlığı və hətta yoxluğu ilə seçilirdi. 1990-cı illərdən əvvələ qədər Koreya Xalq Demokratik Respublikası haqqında Şimali Koreyanın apardığı təbliğat və əksinə, cənubdan Şimali Koreyaya qarşı təbliğatdan başqa çox az şey yazılıb. Bu vəziyyətin dəyişməsinin əsas səbəbi yeni məlumat mənbələri və 1990-cı illərin əvvəllərindəki ABŞ və Şimali Koreya arasındakı nüvə böhranı səbəbilə bu mövzuya artan maraq səbəbindən dəyişdi.

Şimali Koreyanın prezidenti Kim Çen İn bir çox addımlarına görə tənqid oluna bilər, lakin əgər onun məqsədlərindən biri ölkəsini qlobal medianın diqqət mərkəzində saxlamaqdırsa, o, bunda böyük

uğur qazanıb. Təbii ki, Şimali Koreyanın beynəlxalq səviyyədə diqqəti bu qədər öz üzərinə çəkməyinin əsas səbəbləri əsasən yanlış addımlardır. Məsələn, hərbi təxribatlar, gizli nüvə proqramı, iflasa uğramış iqtisadiyyat, insan haqları ilə bağlı dəhşətli və qeyri-sabit rəhbərlik. Qərb mediasında və mətbuatda Şimali Koreyaya qarşı irəli sürülən ittihamların bəzilərinin əsası ola bilər, bəziləri isə şübhəlidir.

Bütün eniş yoxuşlara baxmayaraq Beynəlxalq mühit 1950-ci illərdə Koreyanın ayrı olduğu vaxtdan bəri çox dəyişdi. Cənubi Koreyanın siyasətinin dəyişməsinə beynəlxalq mühitdə baş verən hadisələr və daxili məsələlərlə də öz növbəsində təsir göstərir. 1990-cı illərdə Cənubi Koreya Asiya pələnglərindən birinə çevrildi. Demokratik Cənubi Koreya Amerika himayədarlığı altında 13-cü ən böyük iqtisadiyyata və regionun aparıcı dövlətinə çevrildi. Şimali Koreya və Cənubi Koreya öz inkişafı, dəyəri, prioriteti və ideologiyası ilə getdikcə bir-birindən daha çox fərqlənən ölkələrə çevrilirlər. 1950-ci illərdə iki ölkə arasında münasibətlərin getdikcə yumuşalmasına mane olan xarici faktorlardan (əsasən ABŞ, SSRİ) fərqli olaraq hazırda iki dövlət arasındakı münasibətlərin stabil qalmaması vəziyyəti daha da gərgin edir.

**Ədəbiyyat**

1. https://www.academia.edu/18159528/Early_Cold_War_and_Korean_War
2. Andrei Lankov, The real north Korea-Life and politics in the failed Stalinist Utopia, Oxford University Press, United States, 2013.
3. Victor Cha, The Impossible State Updated Edition (North Korea, Past and Future), Ecco; Reprint edition, 2013
4. Bruce Cumings, The Korean War: A History, Modern Library; Illustrated edition 2011
5. http://www2.law.columbia.edu/course_00S_L9436_001/North%20Korea%20materials/3.html
6. https://eurasiantimes.com/chinas-xi-jinping-north-koreas-kim-jong-un-casts-a-shadow-south/?amp
7. https://koreajoongangdaily.joins.com/2020/08/18/opinion/columns/The-Moon-Jaein-administration-North-Korea-Helsinki-Accords/20200818201500322.html
8. https://theowp.org/reports/the-foreign-policy-challenges-of-moon-jae-in/
9. http://large.stanford.edu/courses/2017/ph241/min2/
10. https://thediplomat.com/2021/12/is-south-korean-culture-a-threat-to-north-korea/
11. https://www.britannica.com/place/North-Korea/Cultural-life
12. https://www.everyculture.com/Ja-Ma/North-Korea.html

**Rəyçi: f.f.d. B.Əliyeva**

Göndərilib: 10.02.2022 Qəbul edilib: 11.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/153-157

**Qərib İqbal oğlu İsmayılzadə**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
qerib.ismayilzade@mail.ru

# ASFALTEN-QƏTRAN- PARAFİN BİRLƏŞMƏLƏRİNİN XARAKTERİSTİKASI VƏ ONLARIN NEFT SƏNAYESİNƏ MƏNFİ TƏSİRİ

**Xülasə**

Dünyada yüngül neft ehtiyatlarının azalması ilə əlaqədar olaraq ağır neftlərin çıxarılmasına maraq birmənalı şəkildə artmaqda davam edir. Neftlərin ağır neft qrupuna aid edilməsi amillərindən biri onların yüksək özlülüyə malik olmaları və tərkibində parafinin miqdarının çox olmasıdır. Buraya əsasən ağır, özlülüyü 30 mPa·san və daha yüksək olan neftlər aiddir. Mütəxəssislərin ilkin hesablamalarına görə ağır neftlərin ehtiyatı yüngül və aşağı özlülüyə malik neft ehtiyatlarından təxminən 1 trl tondan çoxdur. İnkişaf etmiş ölkələrdə belə neftlərə yalnız neft ehtiyatları kimi deyil, ölkənin iqtisadiyyatının yaxın illər ərzində inkişaf faktoru kimi baxılır.

***Açar sözlər:*** neft, asfalten-qətran-parafin birləşmələri, sənaye, mənfi təsir

**Garib Iqbal oglu Ismayilzade**

## Characteristics of asphalten- qatan-parafine compounds and their negative effects on the oil industry

**Abstract**

Due to the reduction of light oil reserves in the world, the interest in the extraction of heavy oil continues to grow unequivocally. One of the factors that make oils belong to the heavy oil group is that they have a high viscosity and a high content of paraffin. This mainly applies to heavy oils with a viscosity of 30 mPa · sec and higher. According to preliminary estimates, heavy oil reserves exceed the reserves of light and low-viscosity oil by about 1 trillion tons. In developed countries, such oils are considered not only as oil reserves, but also as a factor in the development of the country's economy in the coming years.

***Key words:*** oil, asphaltene-resin-paraffin compounds, industry, adverse effects

## Giriş

Azərbaycan neft yataqlarında mövcud olan ehtiyatlarının yüksək özlülüyə malik olmaları və tərkiblərində yüksək miqdarda parafinin olması danılmaz faktdır. Neft hasilatında ağır, yüksək ərimə temperaturuna malik parafin karbohidrogenləri, qatran- asfaltenlər ilə zənginləşmiş neftlərin çıxarılma payı ildən ilə artır. Bundan əlavə, neft hasilatının sürətlənməsi ilə əlaqədar olaraq yeni neft yataqlarının axtarışı da intensiv olaraq davam etdirilməkdədir. Belə yeni neft yataqları adətən, Xəzər dənizinin digər ölkələrlə sərhədyanı zonalarında və kifayət qədər dərinliklərdə aşkar edilir. Həmin neftlər yüksək özlülüyə malik olduqlarından, belə neftlərin çıxarılması, daşınması, işlənməsi və istifadə olunması ciddi problemlər yaradır. Neftdaşıyıcı boruların divarlarında və digər neft emalı vasitələrinin səthlərində parafin çöküntüləri əmələ gəlir ki, bu da həmin zərərli faktorların aradan qaldırılmasına sərf olunan xərclərin artmasına, neft yataqlarının rentabelliklərinin aşağı düşməsinə səbəb olur [5,s.90].

Hazırda neftin çıxarılması zamanı asfalt-parafin çöküntülərinin aradan qaldırılmasına, neftin özlülüyünün azaldılmasına xidmət edən optimal üsulların axtarışı davam edir. Qeyd olunanlarla yanaşı, elm və texnikanın son nailiyyətlərindən biri olan nanomaterialların hazırlanması və onların köməyi ilə mürəkkəb məsələlərin həlli istiqamətində də intensiv tədqiqat işləri aparılır. Azərbaycanın neft çıxarılan ərazisinin çox da böyük olmaması, habelə uzun illərdir ki, neft hasil edilməsi ilə əlaqədar olaraq buruqların neftdaşıyıcı borularla təchiz edilməsi tələb olunan səviyyədə olsa da, yüksək dərəcədə parafinləşmiş, yüksək özlülüyə malik olan neftlərin çıxarılması, daşınması və istifadə edilməsi böyük iqtisadi çətinliklər törədir. Məhz bu səbəbdən də neft sənayesinə aid aparılmış tədqiqat işlərinin əksəriyyəti neft-

in axıcılıq qabiliyyətinin artırılması yollarının axtarılmasına, reoloji parametrlərinin yaxşılaşdırılmasına həsr edilir.

Digər tərəfdən, yüksək qatranlı neftlər laylarda müəyyən struktur mexaniki xüsusiyyətlərə malik olur, həmin neftlərin özlülükləri, hərəkətliliyi sürüşmə gərginliyindən və təzyiq qradientindən asılı olur, onların məsaməli mühitdə süzülmələri Nyuton və Darsi qanunlarına tabe olmur. Neft yataqlarının istismarı prosesində neft laylarının səthi boyunca təzyiq geniş intervalda dəyişir, layın bir hissəsində sürüşmənın dinamik təzyiq qradienti az olur, neftin hərəkətliliyi çox kiçik, özlülüyü isə kifayət qədər böyük olur. İstismarda olan neft yataqlarından çıxarılan neftin tərkibində asfalt-qatran-parafin birləşmələrinin mövcud olduğundan, həmin quyulardan neftin çıxarılması çətinləşdirir. Qatqılar, xüsusi ilə aşağı temperaturlarda, o cümlədən, quyuların dərinliklərində neftdə qeyri- nyuton xüsusiyyətləri yaradırlar. Qeyd olunmalıdır ki, neftin tərkibində qatranın olması ona elastiklik, parafinin olması isə qeyri- xətti özlülük xüsusiyyətləri verir. Yüksək məhsuldarlıqlı neft quyularında neftin axıcılıq qabiliyyəti yüksək olduğundan, neft qaldırıcı və daşıyıcı boruların divarında parafin və digər çöküntülərin yaranması praktiki olaraq müşahidə edilmir [2,s.87].

Neft daşıyıcı boruların divarlarında əmələ gələn asfalt-qatran-parafin çöküntülərinin formalaşmasına və daşıyıcı boruların divarlarında yığılmasına qarşı mübarizə aparmaq üçün ilk növbədə neftin ilkin parametrləri: karbohidrogenlərin miqdarı, fraksiya tərkibi, neftin tərkibində parafinin miqdarı, molekul kütləsi, səthi gərilmə əmsalı, özlülükləri təcrübi olaraq tədqiq edilməli, kənar amillərdən asılı olaraq dəyişmə qanunauyğunluqları müəyyən edilməlidir.

**Əsas hissə**

Asfaltenlər xam neftin tərkibində qara rəngli, eyni zamanda və n-heptanda həll olunmayan birləşmələr sinfidir. Digər tərəfdən toluol kimi aromatik həllediciler asfaltenlər üçün yaxşı həllediciləridir. Üzvi kimya nöqteyi-nəzərindən onlar yan budaqlanan, poliaromatik və heterosiklik aromatik halqalardan ibarət böyük molekullardır. Asfaltenlər canlı bitki və heyvanlarda olan kompleks molekullardan əmələ gəlir və geoloji vaxt ərzində temperatur və təzyiqin təsiri ilə yalnız qismən parçalanmışdır. Asfaltenlər xam neftin qeyri-üzvi komponentinin, o cümlədən kükürd, azot, nikel və vanadium kimi metalların əsas hissəsini daşıyır. Bütün yağların tərkibində müəyyən miqdarda asfalten var. Asfaltenlər yalnız qeyri-sabit olduqda istehsal zamanı problemə çevrilir. Asfaltenin dayanıqlığına ən çox təsir edən amil təzyiqdir. Asfaltenlərin sabitliyi həmçinin turşunun və ya müəyyən növ tamamlayıcı mayelərin əlavə edilməsi və xam neftin emalı prosesində müşahidə olunan yüksək temperaturlar nəticəsində poza bilər [1,s.90].

Ümumiyyətlə, asfaltenlər xam neftlərin əksəriyyətində dayanıqlı olduğundan, onlar az əməliyyat problemi yaradır. Tipik olaraq problemlər yalnız qarışdırma və ya yüksək istilik səbəbindən aşağı axın zamanı baş verir. Qeyri-sabit asfaltenləri olan xam neftlər bəzi ciddi əməliyyat problemlərindən əziyyət çəkir, onların əksəriyyəti çirklənmə ilə bağlıdır və klapanlara, tıxaclara, filtrlərə və borulara təsir göstərir. Quyunun təzyiqi azaldıqca və alifatik komponentlərin həcm payı artdıqca asfaltenlər qeyri-sabit olur. Əgər neftin alifatik hissəsi limit həddinə çatarsa, o zaman asfaltenlər flokulyasiyaya və çökməyə başlayır. Bu təzyiq flokulyasiya nöqtəsi adlanır. Aşağıdakı Şəkil 1.1-də təzyiqin asfaltenin dayanıqlığına təsiri göstərilir. Əyrinin sol tərəfində asfaltenlər qeyri-sabit, əyrinin sağ tərəfində isə asfaltenlər sabitdir.




Hazırda sualtı sistemlərdə asfaltenlərə nəzarət üçün standart dizayn və istismar qaydaları mövcud deyil. Quruda quyular üçün istifadə edilən asfalten nəzarət proqramlarından müəyyən təcrübə əldə

edilmişdir. Yanaşmalar quyu lüləsinin asfaltenlərlə tamamilə bağlanmasına, sonra materialın qazılmasına imkan verməkdən tutmuş materialı çıxarmaq üçün əyilmiş borularla dövri həlledici yuyucu vasitələrdən istifadə etməyə qədər müxtəlif olmuşdur. Ola bilsin ki, nisbətən az sayda operator, bunun xərcləri və dəyişən nəticələrə görə, dispersantlarla asfaltenin çökməsinə nəzarət etməyi seçib [9, s.78].

Asfaltenlər xam neftin qeyri-qütblü və uçucu olmayan komponentləri kimi müəyyən edilir. Yuxarıda dediyim kimi onlar alkanlarda (normal pentan və normal heptan) həll olunmur, lakin aromatik maddələrdə (benzol və toluol) həll olunur. Asfaltenlərin kimyəvi xassələri yaxşı məlum deyil. Ümumiyyətlə, asfaltenlər tərkibində karbon, oksigen, azot və kükürd olan mürəkkəb üzvi maddə kimi tanınır. Bəzi xam neftlərin və qalıqların qara rəngi flokulyasiya etməmiş və çökməmiş asfaltenlərin olması ilə əlaqədardır [3,s.76].

Qatranlar xam neftin qütblü və uçucu olmayan komponentləri kimi müəyyən edilir. Onlar normal alkanlarda və aromatik həlledicilərdə həll olunur, lakin maye propanda deyil. Onların kimyəvi strukturları asfaltenlərə bənzəyir, lakin daha az molekulyar çəki, daha yüksək hidrogen-karbon nisbəti və daha az heteroatomdur. Qatranlar asfaltenlər tərəfindən güclü şəkildə cəlb edilir və onları asfaltenlərdən ayırmaq mümkün olmaya bilər. Asfaltenlər kövrək, parlaq, tünd qəhvəyidən qaraya qədər, amorf və bərk tozlardır, qatranlar isə parlaq, yapışqan və tünd qəhvəyi rəngdədir.

Demək olar ki, neft hasilatı sənayesində hər kəs parafin mumu və asfaltenin yığılması, eləcə də onun neft quyularının hasilatına təsirini çox yaxşı bilir. Dünya neftinin 85%-ə qədəri parafin yataqlarının çökməsinə meyllidir ki, bu da zaman keçdikcə neft axınını elə dərəcədə azalda bilər ki, hasilatı tamamilə dayandırır. Parafin yığılması axın xətləri, borular, kəmərlər və təbii ki, neft quyusunun özü də daxil olmaqla, bütün neftin çıxarılması və ötürülməsi sisteminin səmərəliliyini kəskin şəkildə azalda bilər. Bu yığılmalar neftin bərpası sisteminin tamamilə sıradan çıxmasına səbəb olacaq qədər ciddi ola bilsə də, xoşbəxtlikdən parafin mumunun çirklənməsini aradan qaldırmaq nisbətən asan sayılır.

Neft quyularında parafin yığılmasını aradan qaldırmaq üçün bir sıra üsullar mövcuddur, o cümlədən:

- Mexanik
- Qırıntı
- Bükülmüş Boru
- Termal
- İsti yağlama
- İsti su
- Kimyəvi – Mum Solventləri/Dispersantlar
- Qarışıq üsullar [7,s.10]

### Neft Quyularından Parafinin Kimyəvi Təmizlənməsi

Parafin çöküntülərini aradan qaldırmaq üçün kimyəvi maddə seçməzdən əvvəl, ilk növbədə mum yığılmasının təbiətini nəzərə almaq vacibdir. Mum problemlərindən əziyyət çəkən neft quyuları, əslində, adətən başqa çirklənmələrlə də qarşılaşır. Neft hasilatı zamanı demək olar ki, rast gəlinən hər hansı ağır üzvi çöküntü parafin və ya mum adlanır. Parafinlər adətən bu yataqların əsas komponenti olsalar da, əslində parafinlər və asfaltenlərin qarışığıdır. Bu tip parafin/asfaltenli yataqlarda çox vaxt qatranlar, lil, duz kristalları, qum və gil də olur. Buna görə də bu çöküntüləri aradan qaldırmaq üçün istifadə olunan hər hansı bir həlledicinin parafinlə yanaşı, digər çöküntülərə də təsirli olması vacibdir. Bu gün parafinin ləğvi üçün istifadə olunan bir çox kimyəvi üsulun ən təsirli olması üçün istilik tələb edilir. Ancaq istiliyin sistemə tətbiqi əlavə avadanlıq, enerji sərfiyyatı və məsrəf tələb edir, ona görə də aşağı temperaturda effektiv həlledici tapmaq daha əlverişlidir.

Ən yaxşı parafini çıxaran kimyəvi maddəni seçərkən son və ən vacib məqam təhlükəsizlikdir. Bir çox kimyəvi üsulda işçilər üçün təhlükəli olan və avadanlıqları zədələyə bilən kaustik reagentlərin istifadəsini tələb edir. Eyni zamanda bir çox həlledici əsaslı üsullar insan sağlamlığı və ətraf mühit üçün riskləri artıran zəhərli kimyəvi maddələr ehtiva edir. Buna görə də hansı üsulan istifadə etməyimizdən asılı olmayaraq təhlükəsizlik ən birinci faktor olmalıdır [4,s.87].

**Neft çıxarma sənayesində asfalten- qətran birləşmələrinin yaratdığı mürəkkəbləşmələr**

Asfalten-qətran-parafin çöküntülərinin Neft- mədən avadanlıqlarında formalaşması və onların təmizlənməsi hal- hazırda neft çıxarma sənayesində ən aktual problemlərdən biri olaraq qalmaqdadır. Asfalten-qətran-parafin çöküntülərinin (AQPÇ) müxtəlif geotermiki şəraitdə yaranma səbəbləri hələ indiyənə kimi dəqiq aydınlaşdırılmadığından, onların yaranmasına və təmizlənməsinə qarşı bir mənalı tərkib və yaxud metodiki göstəriş yoxdur.

İstehsalatda AQPÇ- nin yaratdığı mürəkkəbləşmələrə quyuların məhsuldarlığının azalmasını, nasos kompressor borularının (NKB) daxili diametrinin azalmasını, nasosların klapanlarının iş rejiminin pozulmasını, axmaların sərfinin çoxalması nəticəsində onun məhsuldarlığının azalmasını, nəql kəmərlərinin daxili səthinin hamarlığının pozulması nəticəsində təzyiqin çoxalmasını, nəql edilən məhsulun azalmasını və s. misal göstərmək olar [13].

Hal- hazırda Azneft İB-nin Neft- daşınmaları, Səngəçal- dəniz, Ələt- dəniz və bir çox NQÇİ- də parafin çöküntülərinin yaratdığı mürəkkəbləşmələr bir problem olaraq qalmaqdadır. Məsələn Ələt-dəniz sahəsində həm NKB- də, həm də 4-cü dərəcəli atqı xəttlərində parafin çöküntüləri çox böyük problemlər yaradır. Bu sahədə hər ayda NKB-ı 250 dərəcə selsidə isti kondensatla emal olunur. Quyulararası atqı xəttlərindədə parafinin çökməsi ilə problemlər yaranır. İlin soyuq fəsillərin də bu daha da intensiv xarakter alır. Parafin çöküntülərinin təmizlənməsi üçün paragenerator aqreqatlarından (ППУ-3) istifadə edirlər. Bu zaman qızdırılmış buxarın temperaturası 250 dərəcə selsiyə kimi olur.

Dəniz şəraitində belə bir prosesin icrası olduqca çətin və eyni zamanda isə iqtisadi cəhətdən bahalıdır [10,s.87].

Odur ki, təklif olunur ki, elə tədbir həyata keçirilsin ki, ümumiyyətlə NKB- də və eləcə də atqı xəttlərində parafin çöküntüləri yaranmasın. Bu məqsədlə yüksək inhibitorluq keyfiyyətinə və parafin çöküntülərini həll etmə təsirinə malik olan MORE- R və PÇ- R reagentlərindən istifadə edilməsi təklif olunur. Bu reagentlərin parafinin yaratdığı mürəkkəbləşmələrə qarşı tətbiqi yüksək iqtisadi səmərə verməklə yanaşı, istehsalatda iş şəraitini yaxşılaşdırır və eyni zamanda ətraf mühitin ekologiyasına müsbət təsir edir. Lakin bu üsulun çatışmayan cəhətləri də var. Çünki müxtəlif sahələrdən çıxarılan neftin fiziki- kimyəvi göstəriciləri müxtəlif olduğundan, bir sahədə effektli olan reagent digər sahədə öz effektivliyini itirə bilər. Bu problemin həllində il boyu temperaturun dəyişməsini də nəzərə almaq lazımdır.

Bunlardan başqa neft-qazın çıxarılmasında və onun nəqlində ardıcıl və paralel müxtəlif texnoloji problemləri həll etmək lazım olduğundan ( məs: neftin donma temperaturasını və struktur texnoloji göstəricilərini tənzimləmək, AQP çöküntülərinin qarşısını almaq və yaxud yaranmış çöküntüləri təmizləmək və s.) işlədilən reagentlərin təsir formasına görə çoxfunksiyalı olması tövsiyyə edilir.

Respublikamızada belə reagentlərə misal olaraq yuxarıda adları çəkilən MORE və PÇ reagentlərini göstərə bilərik. Bu reagentlər “Neft Daşları” sahəsindəki quyularda müsbət göstəricilərlə tətbiq edilmişdir. Göstərilən reagentlər çox komponentli və çox funksiyalı olması ilə seçilir. Onlar əsasən Neftin donma temperaturasına, parafin çökməyə və boru divarlarında hopmuş parafinin təmizlənməsinə, neftin geoloji parametrlərinin yaxşılaşmasına müsbət təsir edir.

“Neft Daşları” NQÇ- nin quyularında PÇ- R reagentinin yığım məntəqəsi ilə quyulararası atqı xəttlərində neftin nəqli zamanı təzyiqin dəyişməsinə təsiri əyani şəkildə göstərilmişdir ki, bu reagent təzyiqlər fərqinin (ΔP) aşağı düşməsinə kömək edir [11,s.89].

**Nəticə**

Son olaraq Purasolve PWD xam neft parafin həlledicisi haqqında qısa məlumat vermək istəyirəm. Purasolve PWD, parafin mumu və asfaltenlər də daxil olmaqla xam neftdə ağır üzvi maddələrin parçalanması üçün xüsusi olaraq hazırlanmış bio-əsaslı inqrediyentlərin yeni mülkiyyətçi qarışığıdır. Purasolve PWD, xam neft mumlarını və üzvi maddələri effektiv şəkildə həll etmək üçün ənənəvi təhlükəli kimyəvi maddələri əvəz edən güclü buxarlanmayan həllediciidir, vaxta, və pula qənaət edir, eyni zamanda işçilər və ətraf mühit üçün tamamilə təhlükəsizdir.

**Ədəbiyyat**


1. Abbasov E.M., Yurbashiyeva A.O., Guseynov V.G. Control of the disturbances development in the boundary layer under the flow of heterogeneous fluid in the pipes / Modern problems of mathematics and mechanics Proceedings of the international conference devoted to the 80-th anniversary of academician Akif Gadjiyev. Baku, 2017, p.168
2. Bakhtizin R.N., Panakhov G.M., Guseynov V.G. Rheological characteristics of the fluid with fillers // Electron scientific journal “Oil gas” 2015, №1, p.178-200
3. Eyni L., Assareh M., Ayatollahi Sh., Ranjbaran M. An improved modeling approach for asphaltene deposition in oil wells including particles size distribution. Oil & Gas Sci. Technol. Rev. IFP Energies nouvelles. 2018.
4. Gholami A., Moradi S., Asoodeh M., Bagheripour P., Vaezzadeh-Asadi M. Asphaltene precipitation modeling through ACE reaping of scaling equation. Science China Chemistry. 2014. 57. No 12. P. 1774–1780. https://doi.org/10.1007/s11426- 014-5253-1)
5. Gubin V. E. Pipeline transport of oil and oil products / Nedra, 1982. - p.246
6. Hüseynov V.H. Neft kəmərlərində qeyri stasionar proseslərin qiymətləndirilməsi / Riyaziyyat və Mexanika İnstitutunun 55 illiyinə həsr olunmuş Beynəlxalq konfransın materialları, 2014, s. 136
7. Narikov K. A., Kuzyaev A. A., Churikova L. A. Methods and means of cleaning oil product pipelines from inside pipe deposits// Oil and gas technologies and analytics. June 6, 2019 pp. 20-25
8. Norman J. Hyne. Dictionary of Petroleum Exploration, Drilling & Production. — Tulsa, Oklahoma: PennWell Corporation, 2014. — C. 124. — 769 c
9. Panahov G.M., Abbasov E.M., Guseynov V.G., Museibli P.T. Regulation of pipeline transport of heterogeneous systems in condition of uncertainty of initial parameters/ XXIX İnternational Conference Problems of Decision Making unde Uncertainties, Ukraine, 2017, p.97-98.
10. Rezakazemi M., Mirzaei S., Asghari, M., Ivakpour J. Aluminum oxide nanoparticles for highly efficient asphaltene separation from crude oil using ceramic membrane technology. Oil Gas Sci. Technol. Rev. IFP Energies nouvelles. 2017. 72. 34. P. 1–9. https://doi.org/10.2516/ogst/2018019
11. Sattarov R.M., Zeynalov A.N. On increasing the effectiveness of the fight against paraffin deposits in oilfield equipment. ANKh, 2002, No. 11, pp. 53-57
12. Sherif Elkahky, Christopher Lagat, Mohammad Sarmadivaleh, Ahmed Barifcani. Prediction of Asphaltenes Deposition in Multiphase Flow Systems through the use of Novel Numerical Modelling. Global J. Science Frontier Research: A Physics and Space Science. 2019. V. 19. Issue Version 1.0.
13. https://www.sciencedirect.com/topics/engineering/asphaltenes
14. https://www.envirofluid.com/articles/removing-paraffin-wax-build-up-from-oil-wells/


**Rəyçi: prof. N.Zeynalov**

Göndərilib: 14.02.2022 Qəbul edilib: 17.03.2022

DOI: https://www.doi.org/10.36719/2663-4619/76/158-162

**Sevda Vüqar qızı Salmanova**
Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)
magistrant
sevda.salmanova.1999@mail.ru

# MƏRKƏZİ BANKLARIN HƏYATA KEÇİRDİYİ PUL-KREDİT SİYASƏTİNİN MAHİYYƏTİ

**Xülasə**

Monetar siyasət pul-kredit orqanlarının makroiqtisadi siyasətini, qiymət sabitliyini, sabit valyuta məzənnəsinin saxlanmasını əhatə edə bilən son məqsədlərin kombinasiyasına nail olmaq üçün pul bazarının şərtləri (qısamüddətli faiz dərəcəsi, nominal məzənnə və ya bankın cari likvidlik səviyyəsi) vasitəsilə məcmu tələbin idarə edilməsinə yönəlmiş tədbirlər məcmusudur. Monetar siyasətin əsasını pul resurslarının və ümumilikdə pul siyasətinin iqtisadi situasiyaya təsiri prosesini öyrənən pul nəzəriyyəsi təşkil edir. İqtisadçılar uzun müddətdir ki, pul siyasətinin bazar şərtlərində əhəmiyyətini və rolunu müzakirə edirlər.

Hədəflər və alətlər arasında düzgün tarazlığı qorumaq üçün mərkəzi banklar bir real hədəf götürür və ona nail olmaq üçün bir və ya bir neçə alət seçirlər. Mərkəzi Bank bankların koordinasiyasını təşkil etmək və iqtisadi tənzimləmə vasitəsi ilə onların fəaliyyətini tənzimləmək üçün xüsusi səlahiyyətlərə malikdir.

***Açar sözlər:*** *pul-kredit, mərkəzi bank, inflyasiya, iqtisadi vəziyyət, monetar siyasət*

**Sevda Vugar Salmanova**

## The nature of the money-credit system implemented by central banks

**Summary**

Monetary policy is a set of measures aimed at managing aggregate demand through money market conditions (short-term interest rate, nominal exchange rate or current bank liquidity level) to achieve a combination of ultimate goals that can include macroeconomic policy, price stability, and maintaining a stable exchange rate.

The basis of monetary policy is the theory of money, which studies the process of the impact of monetary resources and monetary policy in general on the economic situation. Economists have long debated the importance and role of monetary policy in market conditions.

To maintain the right balance between goals and instruments, central banks take a realistic goal and select one or more instruments to achieve it. The Central Bank has special powers to coordinate banks and regulate their activities through economic regulation.

***Keywords:*** *monetary, central bank, inflation, economic situation, monetary policy*

## GİRİŞ

Mərkəzi Banka geniş səlahiyyətlər verilsə də, onun bəzi fəaliyyətlərində məhdudiyyətlər mövcuddur:

- qanunvericiliklə nəzərdə tutulmuş əməliyyatlardan başqa digər hüquqi və fiziki şəxslərlə bank əməliyyatlarının aparılması;
- qanunla müəyyən edilmiş hallardan başqa istehsal, ticarət, sığorta və digər kommersiya fəaliyyəti ilə məşğul olmaq.

Belə ki, Mərkəzi Bank ikili hüquqi aspektə malikdir və eyni zamanda xüsusi səlahiyyətli dövlət qurumu və iqtisadi fəaliyyətlə məşğul olan hüquqi şəxs kimi fəaliyyət göstərir [3, s. 17-21].

Mərkəzi Bankın mövcud hüquqi mövqeyinin əsas xüsusiyyəti ondan ibarətdir ki, onun inzibati, hüquqi və təsərrüfat fəaliyyətinin həyata keçirilməsi eyni problemin - kredit sisteminin idarə

edilməsinin həllinə yönəlmişdir. Mərkəzi bankın inzibati funksiyalarını aşağıdakılara bölmək olar: təşkilati (pul dövriyyəsinin təşkili və idarə edilməsi) və mülki dövriyyənin mühafizəsi (investorların və kommersiya banklarının digər kreditorlarının maraqları) [4, s. 57-59].

Mərkəzi Bankın fəaliyyətinin əsas məqsədi qiymətlərin sabitliyini, nağd pul dövriyyəsinin tənzimlənməsini, bank və ödəniş sistemlərinin, eləcə də tədiyyə balansının sabitliyini və inkişafını təmin etməkdən ibarətdir. Mərkəzi Bank qarşıya qoyduğu məqsədlərə nail olmaq üçün pul-kredit siyasətini müəyyən edir, əskinasların buraxılması və çıxarılmasını həyata keçirir, manatın xarici valyutalara nisbətdə rəsmi məzənnəsini mütəmadi olaraq müəyyən edir, pul vəsaitlərini qanunvericiliyə uyğun olaraq tənzimləyir və ona nəzarət edir, qızıl ehtiyatlarını saxlayır. Mərkəzi Bank tədiyyə balansı hesabatını tərtib edir, bank fəaliyyətini lisenziyalaşdırır və tənzimləyir, qanunla müəyyən edilmiş bank fəaliyyətinə nəzarət edir, ödəniş sistemlərini təşkil edir, əlaqələndirir, tənzimləyir və nəzarət edir. Ölkə iqtisadiyyatının tənzimlənməsində pul-kredit siyasətinin düzgün tənzimlənməsi böyük əhəmiyyət kəsb edir və kredit tələbatın ödənilməsi üçün əlverişli imkan yaradır.

Bu çərçivədə pul siyasətinin həyata keçirilməsindən məsul olan mərkəzi banklar ölkənin iqtisadi şərtlərini və hökumətin həyata keçirdiyi fiskal siyasətləri məlumat kimi götürərək əsas pul siyasəti hədəflərini müəyyən edirlər.Əsas pul siyasəti hədəflərini müəyyən edən mərkəzi banklar daha sonra bu əsas hədəflərə çatmaq üçün hansı strategiyanın həyata keçiriləcəyinə, seçilmiş strategiya çərçivəsində hansı pul siyasəti alətlərindən istifadə ediləcəyinə və seçilmiş pul siyasətini hansı əməliyyat infrastrukturu üzərində həyata keçirəcəklərinə qərar verirlər.

## ANALİZ

Müasir dövrdə Mərkəzi Bank dövlət iqtisadiyyatının inkişafında və tənzimlənməsində mühüm rol oynayır. Mərkəzi banklar bütün ölkələrin bank sistemlərinin əsas hissəsini təşkil edir. Bəzi ölkələrdə bu banklara müxtəlif adlar verilir: Mərkəzi Bank, Xalq Bankı, Dövlət Bankı, Ehtiyat Bankı, Emissiya Bankı, Federal Ehtiyat Sistemi. Bəzi ölkələrdə isə yalnız ölkə adları ilə birlikdə, məsələn, İtaliya Bankı, Yaponiya Bankı və s. adlanır.

Pul siyasətinə adətən ölkənin mərkəzi bankı (nümunə kimi, ABŞ-da Federal Ehtiyat Bankları, Böyük Britaniyada İngiltərə Bankı, Almaniyada Almaniya Federal Bankı və Azərbaycanda Milli Bank) nəzarət edir.

Avropa ölkələrində Fransa və İtaliyanın mərkəzi bankları pul siyasətinin həyata keçirilməsində digərlərinə nisbətən dövlət institutlarından daha az asılıdır. Bu ölkələrdə Mərkəzi Bankın işinə müdaxilə etmək hüququ qanunla hökumətə verilir.Mərkəzi Bank məsləhətçi kimi çıxış edir və hökumətin qərarlarını rəhbər tutmalıdır. Böyük Britaniya, Hollandiya, İsveç və Yaponiya qanunları dövlət orqanlarının Mərkəzi Bankın işinə müdaxilə etmək, ona göstəriş vermək və qərarını ləğv etmək imkanlarını tam şəkildə müəyyən edir [6, s. 480].

ABŞ-da Federal Ehtiyat Sistemi mərkəzi bankın funksiyalarını yerinə yetirmək və Amerika Birləşmiş Ştatlarının kommersiya bank sistemi üzərində mərkəzləşdirilmiş nəzarətini həyata keçirmək üçün 23 dekabr 1913-cü ildə xüsusi olaraq yaradılmış müstəqil federal agentlikdir. Federal ehtiyat sisteminin tərkibinə iri şəhərlərdə yerləşən 12 federal ehtiyat bankı, üç minə yaxın kommersiya bankı, prezidentin təyin etdiyi Rəhbərlər Şurası, Federal Bazar Komitəsi və məsləhət şuraları daxildir. Federal Ehtiyat Aktı bankın yaradılması üçün əsasdır. Hökumət Federal ehtiyat sisteminin idarə edilməsində həlledici rol oynayır, baxmayaraq ki, kapitalın mülkiyyət forması özəl - səhmlərin xüsusi statusuna malik səhmdardır.

Alman Federal Bankı Almaniyanın mərkəzi bankıdır. Almaniya Federal Bankı və Almaniya Federal Maliyyə Nəzarəti Orqanları birlikdə Almaniyanın maliyyə tənzimləyici orqanlarıdır. "Bundesbank"ın baş ofisi Frankfurt-am-Main şəhərində yerləşir.

Türkiyə Respublikasının Mərkəzi Bankı Türkiyə Respublikasının mərkəzi bankıdır. Mərkəzi bankın vəzifələri arasında pul və məzənnə siyasətinin yürüdülməsi, Türkiyənin beynəlxalq rezervlərinin idarə edilməsi, eləcə də banknotların çapı və buraxılması, ölkədə ödəmə sistemlərinin yaradılması, saxlanılması və tənzimlənməsi yer alır. Türkiyə Respublikası Mərkəzi Bankı

Türkiyədə qiymət və maliyyə sabitliyinə nail olmaq və qorumaq üçün qanunla tapşırılıb və bu məqsədlərə çatmaq üçün sərəncamında olan hər hansı bir siyasət alətini öz mülahizəsinə əsasən istifadə etmək səlahiyyətinə malikdir. Türkiyə Respublikası Mərkəzi Bankı 2006-cı ildən etibarən tam inflyasiya hədəfləmə rejimini izləyir [7, s. 412].

Azərbaycan Respublikasının Mərkəzi Bankı "Azərbaycan Respublikası Milli Bankının yaradılması haqqında" Azərbaycan Respublikası Prezidentinin 1992-ci il 11 fevral tarixli Fərmanı ilə yaradılmışdır. 2009-cu il martın 18-də keçirilmiş "Azərbaycan Respublikasının Konstitusiyasına əlavələr və dəyişikliklər haqqında" referendum haqqında Qanunun qüvvəyə minməsi ilə əlaqədar Azərbaycan Respublikasının Milli Bankı Mərkəzi Bank adlandırılmışdır. Azərbaycan Respublikasının Konstitusiyasında Mərkəzi Bankın ölkənin milli valyutasının buraxılması üzrə funksiyası təsbit edilmişdir. Mərkəzi Bankın "Azərbaycan Respublikasının Mərkəzi Bankı haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilmiş səlahiyyətləri çərçivəsində fəaliyyətinin əsas məqsədi qiymət sabitliyinin təmin edilməsidir [1, s.80].

Rusiya Federasiyasının Mərkəzi Bankı (Rusiya Bankı) Rusiyada xüsusi dövlət-hüquq qurumu, birinci dərəcəli əsas bankdır. Rusiya Federasiyası Hökuməti ilə birlikdə vahid dövlət pul siyasətini hazırlayan və həyata keçirən ölkənin əsas emissiya və pul tənzimləyicisi və xüsusi səlahiyyətlərə, xüsusən də əskinasların buraxılması və fəaliyyətini tənzimləmək hüququ verilir.

Rusiya Bankı ölkənin bütün kredit sisteminin əsas əlaqələndirici və tənzimləyici orqanı kimi çıxış edərək, iqtisadi idarəetmə orqanı kimi çıxış edir. Rusiya Bankı kredit təşkilatlarının fəaliyyətinə nəzarət edir, onlara bank əməliyyatları aparmaq üçün lisenziya verir və ləğv edir və artıq kredit təşkilatları digər hüquqi və fiziki şəxslərlə işləyir.

İngiltərə Bankı Böyük Britaniyada mərkəzi bank kimi fəaliyyət göstərən xüsusi dövlət qurumudur. O, ölkənin pul siyasətinin idarə edilməsinə cavabdeh olan Pul Siyasəti Komitəsinin işini təşkil edir. İngiltərə Bankı mərkəzi bankın bütün funksiyalarını yerinə yetirir. Bunlardan ən əsası qiymət sabitliyini qorumaq və iqtisadi artımı təmin etmək üçün Hökumətin iqtisadi siyasətini dəstəkləməkdir. İngiltərə Bankı İdarə Heyəti tərəfindən idarə olunur. O, Qubernatordan, iki müdir müavinindən və idarə heyətinin 16 üzvündən ibarətdir. İdarəçilər Böyük Britaniya Parlamenti tərəfindən təsdiqləndikdən sonra kral fərmanı ilə təyin edilir [5, s. 46].

Yaponiya Bankı Yaponiyanın mərkəzi bankıdır. 1953-cü ildə təsis edilib və 1956-cı ildə fəaliyyətə başlayıb. Baş ofisi Tokionun Çuo rayonunda yerləşir. Yaponiya Bankı 10 oktyabr 1882-ci ildə Meiji dövründə Yaponiya Bankı Aktı ilə yaradılmışdır. Bank yeni əskinaslarının və sikkələrin paylanmasına, maliyyə sisteminin sabitliyinin təmin edilməsinə, pul siyasətinin həyata keçirilməsinə və məzənnə siyasətinin aparılmasına cavabdehdir. Yaponiya Bankı Federal Ehtiyat Sistemi və Avropa Mərkəzi Bankı ilə birlikdə dünyanın üç əsas mərkəzi bankından biridir.

## NƏTİCƏ

Mərkəzi Bankın həyata keçirdiyi pul siyasəti ilk növbədə milli valyutanın daha da sabitləşməsinə və inflyasiyanın aşağı səviyyədə saxlanmasına yönəlib. Bunlar iqtisadi artımı təmin etmək üçün investisiya siyasətinin həyata keçirilməsi üçün zəruri şərtlərdir. Mərkəzi Bank pul dövriyyəsinin tənzimlənməsinə, milli valyutanın möhkəmlənməsinə, bank sisteminin inkişafına, formalaşmasının tənzimlənməsində bütün təsərrüfat təşkilatları tərəfindən depozitlərin yaradılmasına obyektiv təminat verir. Xarici və milli valyutalarda aktivlərin gərginliyini tarazlaşdırmaq məqsədi monetar siyasətin tərkib hissəsidir. Bu siyasət ilk növbədə ölkədə inflyasiyanın optimal səviyyəsini müəyyən etmək üçün valyuta ehtiyatlarından istifadə etmək məqsədi daşıyır.

Mərkəzi Bank kredit sistemini həyata keçirən və tənzimləyən qurumdur. İqtisadi siyasətin tərkib hissəsi olan pul-kredit siyasəti vasitəsilə dövlət iqtisadi inkişafın məqsədlərinə və mürəkkəb iqtisadi proseslərə, o cümlədən ümumi milli məhsulun həcminə, inflyasiyaya, milli valyutaya və investisiya prosesinə təsir göstərir. Bazar iqtisadiyyatı şəraitində pul siyasətinin işlənib hazırlanması və həyata keçirilməsi, ölkənin bank sektorunun yüksək fəallığı, milli valyutanın alıcılıq

Müasir cihazlarda siqnalların ilkin emalı məsələlərini həll etmək üçün müxtəlif tipli və təyinatlı mikroprosessor və emal alqoritmlərin reallaşdırılması proqram üsulu ilə yerinə yetirilir.Emal nəticələri istifadəçiyə qrafik şəkilində, cədvəllər formatında təqdim oluna bilər, lakin saxlama qurğularına da daxil edilə bilər. Məsələn, statistik emal qurğularına, tibbi verilənlər bazasına (fərdi kopüterin istfadəsinə əsaslanan) və s. Bu halda fərdi kompüterlər elektrofizioloji siqnalların alınması və emalı qurğuları ilə əlaqə üçün xüsusi interfeyslərlə təmin olunur.

**Elektrokardioqrafik siqnalların veyvlet çevirmə əsasında diaqnostik təhlili**

Ürəyin fəaliyyəti elektrik hadisələri ilə müşayiət olunur. Oyanma qabiliyyətinə malik olan bütün toxumalar müsbət elektrik yükü ilə yüklənir. Oyanma əmələ gəldikdə oyanmış sahənin elektrik yükü mənfi yükə çevrilir.Bu qanunauyğunluğa ürək də tabe olur. Oyanma əmələ gəldiyi zaman, yəni mənfi elektrik yükü ilə yükləndiyi zaman oyanmış sahə ilə oyanmamış sahə arasında potensial fərqi yaranır oyanma yoxdursa, yəni mənfi elektrik dalğaları yayıldıqca, daha yeni sahələr mənfi elektrik yükü ilə yüklənir, deməli yeni sahələrdə də potensiallar fərqi yaranır. Xüsusi həssas cihazları işləyən orqanlara birləşdirsək təsir cərəyanı (orqan fəaliyyətə olduqda qeyd edilən cərəyana deyilir) müşahidə etmək hətta qeydə də almaq olar[6].

EKQ ürək xəstəliklərinin diaqnostikasında tətbiq edilən əsas metodlardan biridir. Yığılan ürək əzələlərində elektrik hadisələrinin olmasını 1856-cı ildə alman alimləri R.Kelliker və İ.Müller müşahidə etmişlər. Onlar müxtəlif heyvanlarda açıq ürək üzərində tədqiqat aparırdılar. Lakin 1873-cü ilə qədər ürəyin elektrik impulslarının öyrənilməsinə imkan verən cihazlar yaradıldıqdan sonra bu cihazların köməyi və təkmilləşdirilməsindən sonra bədən üzərindən bu biopotensialların qeyd olunması mümkün oldu. İngilis fizioloqu A.Uoller tərəfindən ürəyin miokard infarktı zamanı ürəyin elektrik aktivliyini qeyd etdi. Lakin bu tədqiqatların nəticələrinin praktikaya tətbiqi hələ mümkün deyildi. EKQ-nı ilk dəfə tibbi praktikaya Holland fizioloqu Villiam Eyntxoven tərəfindən gətirilmişdir. İlk kardioqrf 270 kq ağırlığında idi və ona 5 nəfər xidmət edirdi. Bu dövrdə bu həkimlərin əlində insanın ürəyinin fəaliyyəti haqqında məlumat verən cihaz var idi. Eyntxovenin təklifi ilə elektrodlar əllərə ayaqlara birləşdirilirdi ki, bu təklifdən indiyə qədər də istifadə olunur. O, sağ və sol əllər arasında (I aparma), sağ əl ilə sol arasında (II aparma) və sol əl ilə sol ayaq arasında (III aparma) potensiallar fərqinin ölçülməsini təklif edirdi. Eyntxovenin əməyi yüksək qiymətləndirilərək ona 1924-cü ildə Nobel mükafatı verildi. Sonralar elektrodların Vilson tərəfindən döş qəfəsinin üzərinə birləşdirilməsi metodu da təklif edildi.

Elektrokardioqramada Q, R, S, T ilə işarə olunmuş 5 dişciyi vardır. P-dişciyi qulaqcıqların sistolasına, Q,R,S,T dişcikləri isə mədəciklərin sistolasına uyğun gəlir. Ürəyin fəaliyyətinin ən kiçik pozğunluqları əyridəki şəkildə tez əks olunur. EKQ müxtəlif sürətlərlə qeyd olunur. Adətən kağızın hərəkət sürəti 25 mm/san. təşkil edir. Bu zaman 1 mm əyri 0,04 saniyəyə bərabərdir. Bəzən daha ətraflı analiz üçün 50 mm/san və hətta 100 mm/san sürətindən də istifadə olunur[7].

Kardioqrafik informasiyanın riyazi-kibernetik vasitələr əsasında təhlili və avtomatlaşdırılmış diaqnostika problemnin həlli istiqamətində aparılan tədqiqatlar əks etdirilir. Ənənəvi spektral metodologiyasından fərqli olaraq tətbiq edilən veyvlet alqoritmlərinin bir sıra mühüm üstünlükləri göstərilir. Ürək fəaliyyətində depolyarizasiya kompleksinin (QRS kompleksi) kardioqrafik parametri olan baş dişlər arası intervalların (R-R intervalları) daşıdıqları tibbi-kardioloji informasiya bir neçə veyvlet konstruksiyaları vasitəsi ilə aşkarlanmaq üçün sınaqdan keçirilir və onların daha effektiv variantı ilə bağlı qrafik görüntülər müzakirə olunur.

Elektrokardioqrafiya (EKQ) siqnallarının riyazi kibernetik metodlar əsasında təhlili avtomatlaşdırılmış diaqnostika probleminin mühüm tərkib hissəsidir. Bu sahədə aparılan elmi-tədqiqat işləri və praktiki fəaliyyət sürətli inkişaf mərhələsini yaşayır. EKQ siqnalının tədqiqatı çoxcəhətlidir. Siqnalların riyazi kibernetik təhlili tibbi diaqnostika amilləri ilə paralel aparılmalı olduğundan, tədqiqat metodologiyası fənlərarası mahiyyət daşıyır. Məhz bu səbəbdən ənənəvi spektral təhlil metodologiyası ilə yanaşı müasir riyazi -kibernetik təhlil metodlarının cəlb olunmasına maraq yüksəlmişdir. [8]

Tibbi diaqnostik baxımdan geniş informasiya mənbəyi olaraq ürək döyüntüləri arasındakı R-R intervallarının müqayisəli təhlili diqqəti xüsusi olaraq cəlb edir [1, 2]. Müvafiq elektrokardioqrafik impulslar ardıcıllığında spesifik əlamətlər axtarışı, təəssüf ki, spektral analizə istinadən müvəffəqiyyət

əldə edə biməmişdir. EKQ siqnalları ürəyin elektrik aktivliyi qeydiyyatından başqa, küyləri də daxil edir. Buraya dəyişən elektrik cərəyanı fonu, əzələlərin gərilməsinin yaratdığı yuksək tezlikli rəqslər və siqnalverici bədənlə kontakt yerlərindəki müqavimətdən yaranan küylər daxildir. Yuksək tezlıklı rəqsləri filtrlərin köməyi ilə asanlıqla təmizləmək olur, lakin bu zaman depolyarizasiya kompleksində (QRS kompleksi) siqnalı qismən silinir. Digər problem ənənəvi spektral analizin müəyyən müayinə müddəti ərzində ortalaşdırılmış statistika təşkil etdiyi, zaman ardıcıllığı üzrə lokallaşdırma imkanının olmamasıdır. Veyvlet təhlilinin zaman ardıcıllığı üzrə lokallaşdırma vasitəsi kimi mühüm cəhəti ürək ritminin daşıdığı patologiya əlamətlərinin aşkarlanmasında mühüm rol oynaya bilməsidir. Apardığımız tədqiqat təkcə R-R intervallarının qiymətləndirilməsində lazımi dəqiqliyin əldə edilməsi ilə məhdudlaşmamışdır. R-impulsların xarakterik formalarının qeydiyyatı, impulsun ön və arxa cəbhələrində təfərrüatı diqqət mərkəzində olmuşdur [9].

Beləliklə, R-R intervallarının kompleks təhlili veyvlet analizi ön plana çəkmiş olur. EKQ siqnallarının QRS kompleksinin R dişləri və onların zaman koordinatı üzrə qeydiyyatı aparılır. R-impulsların amplitudlarının müxtəlifliyi şəraitində R-R intervalının koordinatlarının müəyyənləşdirilir. Adi hamarlayıcı süzgəcləmədən istifadə etdikdə R dişlərinin labüd sürətdə zaman üzrə sürüşməsi qaçılmazdır. Sürüşməni aradan götürmək üçün adaptiv filtrasiyadan istifadə, göründüyü kimi, müsbət nəticə verir. Veyvlet analizinə əsaslanan alqoritmlərin daha perspektivli və tətbiqi baxımdan daha asan realizə oluna bildikləri təkcə adaptiv filtrasiya ilə bitmir. Baxılan tədqiqatla yanaşı QRS kompleksinin təhlili də veyvlet metoduna istinadən qənaətbəxş nəticə verə bilir. Bu problemlərlə əlaqədar olaraq müxtəlif bazis veyvlet sintezi məsələsi meydana çıxır. Məlum veyvletlərin empirik yolla məsələyə uyğunlaşması yoxlanılır. Matlab proqramının imkanlarından istifadə edilməklə müxtəlif imitasiya variantları nəzərdən keçirilmişdir.

Əldə etdiyimiz belə bir qənaət xüsusən diqqətə layiqdir ki, bir sıra praktiki tətbiqi məsələlərdə müvəffəqiyyətlə istifadə olunan Dobeşi (db3) veyvleti kardioqrafik informasiyanın da aşkarlanmasında müsbət nəticələr verir. Həmin veyvlet analiz 3-səviyyəli dekompozisiya mərhələlərini keçir. Siqnal s=a3+d3+d2+d1 şəklinə gətirilir.

Spektrin vertikal oxda loqarifmik miqyasda a miqyasına keçməyin müsbət cəhəti obrazların özəlliyini nəzərə çarpdırmaq baxımından əhəmiyyəti şübhəsizdir [3, 4]. Adaptiv filtrasiya üçün spektr müxtəlif miqyaslarda hissələrə ayrılır. Qeyd edək ki, mərkəzi hissə R dişini, orta hissə (280–500) bütün QRS kompleksini və nəhayət daha boyük hissə tam siqnalı göstərir. Filtrin buraxma zolağının bu şəkildə məqsədyönlü dəyişdirilməsinə (idarə olunması), yəni adaptiv alqoritmlərin işlənməsinə zərurət yaradı [10].

Ənənəvi Fürye çevirməsi texnikanın bir sıra sahələrində tətbiq edilirsə, qeyri stasionar siqnalların analizində bir çevirmə özünü doğrultmur. Furye çevirməsində çatışmayan cəhət pəncərəsinin optimal ölçüsünün seçilməsi siqnalın spektral xassəsini xarakterik vaxt aralığında öyrənməyi tələb edir. Veyvlet nəzəriyyəsində tədqiq olunan siqnalın tezliyindən asılı olaraq adaptiv pəncərə öz ölçülərini dəyişir [11].

Tibbdə elektrokardioqrafiyada, elektroensefoloqrafiyada, elektromioqrafiyada elektrofizioloji siqnalların xarakteri qeyi stasionar olduğu üçün bu siqnalların spektrilərinin inteqralını hesabladıqda spektral filtrləmədən istifadə olunur. Bu siqnallar zamana görə dəyişən olduğundan müxtəlif tezlik diapozonlarını əhatə edirlər. Qeyri stasionar siqnalların spektral xassəsini müəyyən etmək lazımdır ki, bu zaman qaus pikləri sisteminin modelindən istifadə olunur və onun maksimumu təyin edilir. Təkrari veyvlet çevirməsi metodu qeyri stasionar modulyasiyanın xarakteristikasını təyin edir ki, o da tezliyin altdiapozonunu spektri üçün xidmət edir [12].

Bununla əlaqədar olaraq, EKQ siqnalların spektral analizi üçün bizim tərəfdən paylanmanın veyvlet- paket sxemindən istifadə edilmişdir. Bu yanaşma veyvlet paylanmanın klassik sxeminin təkmilləşdirilmiş forması olub, məğzi ondan ibarətdir ki, analiz edilən siqnal piramidasının hər səviyyəsində YT toplananların əlavə emalı aparılır. Nəticədə “ tam ” (balanslaşdırılmış ) ağac alınır. Alınan ağacın budaqlarına bazalı alt fəza siqnalları müvafiqdir. Belə qurma kiçik miqyaslı analiz nəzəriyyəsinə əsasən həm də birtərəfli ağaclar üçün qurulmuş sayılır.

## Nəticə

EKQ-nin tezlik baxımından təhlili adaptiv filtrasiyadan keçdikdən sonra həyata kecirilməlidir. Adaptasiya alqoritmlərinin işlənməsi bu sahədə müstəqil araşdırmaların aparılmasını şərtləndirir. Bu məqsədi daşıyan və veyvlet analizinə əsaslanan alqoritmlər daha perspektivlidirlər və tətbiqi baxımdan daha asan realizə oluna bilərlər. Elmi-tədqiqat işi AMEA 2015-ci il üzrə "Freym nəzəriyyəsi-veyvlet analizin seysmologiyada və digər sahələrdə siqnalların tətbiqi" elmi-tədqiqat pro ***Tredmille-də yükləmə sınaqlarının (testinin) keçirilməsi-*** "Klassik" EKQ müayinəsi çoxdəfəli sinə və döş elektrodlarından istifadə etməklə keçirilir. Lakin yükləmə (gərginlik) sınaqlarında birdəfəlik elektrodların istifadəsi məqsədəuyğundur. Çünki idmançı qaçış bandında hərəkət edən zaman onun hərəkətinə maneə törədə bilər.

Yükləmə vaxtı küyün alınmasının 3 səbəbi var: böyük əzələlərin hərəkəti zamanı yaranan eletrik siqnalları (mioqrafik küylər), dərinin səthində elektrodların yerdəyişməsi, üçüncü ən əsas səbəb kabelin titrəyişidir (vibrasiyasıdır). Bunu aradan qaldırmaq çox sadədir. Birinci kabelin uzunluğunu azaltmaq , ikincisi isə kardioqrafı idmançının bədəninə yerləşdirmək lazımdır. Bundan başqa güclü küyləri aradan qaldırmaq üçün rəqəmli süzgəclərdən istifadə olunur.

## Ədəbiyyat

1. Practical elektrocardiography. Flaxkampf F.A. MEDpress-inform. 2013, 872 p. 4.
2. Functional stress tests in the diagnosis of coronary heart disease. Lupanov V.P. IntelTech. 2012, 224 p.
3. Guide to functional diagnostics in cardiology. Modern methods and clinical interpretation. Vasyuk Yu.A. Practical medicine. 2012, 164 p.
4. Zudbinov Yu.I. ABC ECG. - Edition 3. - Rostov-on-Don: "Phoenix", 2003. - 160 p. - 5000 copies. — ISBN 5-222-02964-6.
5. Myasnikov A. L. Experimental myocardial necrosis. - M. Medicine, 1963.
6. Sinelnikov R. D. Atlas of human anatomy. - M. Medicine, 1979. - T. 2.
7. Brawnwald L. D. Heart disease. - 1992. - S. 122.
8. Spassky KV The role of filtration potential in the origin of repolarization waves and massage waves. — Minsk: Medico-social expertise and rehabilitation. Issue #3. part #2, 2001.
9. Spassky K.V. The role of the potential of the line in the molding of the tail of the terminal part of the shunochkovy complex ЄKG. - Minsk: Bulletin of the University "Ukraine", 2007.
10. Ch. 5. Analysis of the electrocardiogram / S.Pogvizd // Cardiology in tables and diagrams / Ed.: M. Fried, S.Grines. -M .: Practice, 1996. -728 p. — ISBN 5-88001-023-6.
11. Doshchitsin V.L. Electrocardiographic differential diagnosis / V.L.Doshchitsin. -M.: MEDpress-inform, 2016, 232 p
12. Doshchitsin V.L. Handbook of practical electrocardiography / V.L.Doshchitsin. -M.: MEDpress-inform, 2019, 416 c.

**Rəyçi: dos. R.Rəhimov**

Göndərilib: 16.02.2022 Qəbul edilib: 15.03.2022

# İÇİNDƏKİLƏR

## HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
### HUMANITIES AND SOCIAL SCIENCES

## TEXNİKA ELMLƏRİ
## TECHNICAL SCIENCES



---

Çapa imzalanmışdır: 18.03.2022
Kağız formatı : 60/84
H/n həcmi: 21,75 ç.v.
Sifariş: 483

"ZƏNGƏZURDA" çap evində çap olunub
**Redaksiya ünvanı:** Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru

